QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
*Məhəmməd Peyğəmbər (S.)*

Mart 2016
03 (1076)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ



## Dövlət ümumi təhsil müəssisələrində çalışan bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi aparılan müəllimlərin əməkhaqqının artırılması haqqında

### *Azərbaycan Respublikası Prezidentinin Sərəncamı*

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, dövlət ümumi təhsil müəssisələrində çalışan işçilərin sosial müdafiəsini gücləndirmək məqsədi ilə qərara alıram.

1."Dövlət ümumi təhsil müəssisələrində çalışan bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi aparılan müəllimlərin dərs yükünün və əməkhaqqının artırılması haqqında" Azərbaycan Respublikası Prezidentinin 2015-ci il 16 yanvar tarixli 994 nömrəli Sərəncamının 1-ci hissəsinə uyğun olaraq müəyyən edilmiş aylıq vəzifə maaşları 2016-cı il aprelin 1-dən orta hesabla 10 faiz artırılsın.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti:

2.1. bilik və bacarıqların diaqnostik qiymətləndirilməsi aparılan dövlət ümumi təhsil müəssisələrində çalışan müəllimlərin, həmin müəssisələrin direktor və direktor müavinlərinin vəzifə maaşları sxemi və məbləğlərini, vəzifə maaşlarına əlavələrin məbləğlərini 2016-cı il aprelin 1-dək təsdiq etsin;

2.2. Azərbaycan Respublikası Prezidentinin aktlarının bu sərəncama uyğunlaşdırılması ilə bağlı təkliflərini üç ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin;

2.3. Azərbaycan Respublikası Nazirlər Kabinetinin normativ hüquqi aktlarının bu sərəncama uyğunlaşdırılmasını üç ay müddətində təmin edib Azərbaycan Respublikasının Prezidentinə məlumat versin;

2.4. bu sərəncamdan irəli gələn digər məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**

*Bakı şəhəri, 17 mart 2016-cı il*

# ADPU-da Novruz bayramı şənliyi keçirilib



Mart ayının 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında Novruz bayramı şənliyi keçirilib. Qeyd edək ki, bayram şənliyində ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi ilə yanaşı, Səbail Rayon İcra Hakimiyyətinin (RİH), Yeni Azərbaycan Partiyasının Gənclər Birliyinin və Azərbaycan Tələbə Gənclər Təşkilatları İttifaqının nümayəndələri də iştirak ediblər.

Bayram şənliyindən öncə ADPU-nun tələbələrinin Novruz bayramına həsr etdikləri rəsm sərgisinə və bayram xonçalarına baxış keçirilib. Tədbirdə əvvəlcə Azərbaycanın Dövlət Himni səsləndirilib. Sonra tələbələrin hazırladıqları bədii-musiqili hissə başlayıb. Milli geyimdə olan tələbə-gənclərin musiqi sədaları altında türkdilli dövlətlərin, o cümlədən Novruz bayramının keçirildiyi digər ölkələrin bayraqlarını zala gətirmələri alqışlarla qarşılanıb. Tələbə Gənclər Təşkilatının Novruz bayramı ilə əlaqədər hazırladıqları videoçarx, müdrik Dədə Qorqudun Novruzla bağlı səsləndirdiyi fikirlər, bayramın rəmzlərindən və adətlərindən olan səməni, xonça, qapılara papaqatdı, pəhləvanların güləşməsi, ocaq başında rəqs, eyni zamanda Novruz personajları olan Kosa, Keçəl və Bahar qızın şən zarafatları, həmçinin tələbələrin ifasında "Uzundərə" rəqsi və digər musiqilər tədbir iştirakçılarına xoş ovqat bəxş edib. Bədii-musiqili hissənin sonunda rəsm sərgisinin qaliblərinə sertifikatlar təqdim edilib,ən yaxşı xonçanın sahibi müəyyən edilib.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov təbrik nitqi ilə çıxış edərək hamını Novruz bayramı münasibətilə təbrik edib, cansağlığı, uzun ömür, bol ruzi-bərəkət və işlərində uğurlar arzulayıb. Novruz bayramının tarixindən, adət-ənənələrindən, özunəməxsusluğundan danışan rektor Y.Məmmədov bildirib ki, Novruz bayramı xalqımızın mənəvi dünyasını, milli düşüncə tərzini, mifik görüşlərini, folklorunu, milli varlığını ifadə edir. Novruz bayramı bolluğun, bərəkətin, xeyirxahlığın təcəssümüdür. Novruz bayramı ulu əcdadlarımızın bizə gözəl yadigarıdır. Azərbaycanda bu bayram çox qədim zamanlardan əsl milli bayram kimi qeyd olunur. Xalqımız yazın gəlişini ilaxır çərşənbələrindən Novruz axşamınadək müxtəlif şənlik və mərasimlərlə qarşılayır. Təbiətin canlanması ilə başlayan hər yeni ilin firavanlıq, xoşbəxtlik və əmin-amanlıq gətirməsini arzulayır. Tarix boyu heç bir qüvvə Novruz bayramını xalqımızın əlindən almağa, onu insanlarımızın qəlbindən, yaddaşından çıxarmağa nail ola bilməmişdir. Xalqımız Novruz bayramı ilə bağlı adət-ənənələri göz-bəbəyi kimi qorumuş və onları yaşadaraq, bügünümüzə çatdırmışdır.

Novruz bayramı yalnız Azərbaycanda deyil, eləcə də dünyanın bir çox ölkələrində yaşayan 50 milyondan çox soydaşımız üçün milli birliyimizin həqiqi rəmzinə çevrilmişdir. Elə bu səbəbdən də onlar Bahar bayramını böyük ruh yüksəkliyi ilə qeyd edirlər. Həm Şərq dövlətlərinin, həm də Türk dünyasının böyük bayramı olan Novruz Azərbaycanla yanaşı, Türkiyədə, İranda, Türkmənistanda, Özbəkistanda, Tacikistanda, Əfqanıstanda və dünyanın bir çox ölkələrində qeyd edilir.

Rektor Y.Məmmədov çıxışı zamanı bildirib ki, ümummilli lider Heydər Əliyevin təşəbbüsü ilə 1997-ci ildən Novruz bayramının ölkəmizdə rəsmi qaydada qeyd edilməsinə başlanılmışdır. Ulu öndər Heydər Əliyev paytaxtda Novruz bayramı münasibətilə keçirilən xalq şənliklərində iştirak edir, sadə vətəndaşların bayram əhval-ruhiyyəsini, sevinc hisslərini bölüşürdü. Bu, dahi öndər Heydər Əliyevin Novruz bayramına olan diqqətinin, xüsusi münasibətinin təzahürü idi. Dünya şöhrətli siyasi xadim Heydər Əliyevin müdrik dövlətçilik kursunun, strateji inkişaf konsepsiyasının layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin milli-mənəvi dəyərlərimizə, o cümlədən Novruz bayramına olan qayğıkeş münasibəti bu gün eyni ənənəni yaşadır.

Rektor Y.Məmmədov qeyd edib ki, Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Yeni Azərbaycan Partiyasının Sədr müavini, millət vəkili, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyevanın təşəbbüsü, səyləri və bu istiqamətdə apardğı səmərəli əməli fəaliyyəti nəticəsində Novruz bayramı 2009-cu il sentyabr ayının 30-da BMT-nin ali mədəniyyət qurumu olan UNESKO-nun qeyri- maddi mədəni irs siyahısına daxil edilmişdir. 2010-cu il fevral ayının 23-də isə BMT Baş Məclisinin 64-cü sessiyasının qərarı ilə 21 mart rəsmi qaydada Beynəlxalq Novruz Günü elan edilmişdir. Yəni Novruz bayramı artıq 2010-cu ildən başlayaraq dünya səviyyəsində qeyd edilən beynəlxalq bir təqvimə çevrilmişdir. Bununla yanaşı,xalqımızın ən qədim və məşhur sənət növlərindən biri olan xalçaçılıq sənəti Mehriban xanım Əliyevanın vətənpərvər fəaliyyəti sayəsində UNESKO-nun qeyri-maddi mədəni irs siyahısına daxil edilmişdir. Bunlardan sonra xalqımızın qədim musiqi aləti olan tar UNESKO-nun qeyri-maddi mədəni irs siyahısına daxil edildi, daha sonra isə milli rəqslərimiz və çövkən oyunu da bu siyahıya daxil edildi. Mehriban xanım Əliyeva həm də muğam sənətinin daha da inkişaf etməsində və dünyada yüksək səviyyədə təbliğ edilməsində əvəzsiz xidmətlər göstərmişdir.





Tədbirin sonunda universitetin həyətində Novruz tonqalı alovlandırılıb. Tələbə-gənclər tonqal ətrafında dövrə vuraraq rəqs edib, maraqlı konsert proqramı ilə çıxış ediblər. Bayram şənliyi universitetin kollektivinin böyük sevincinə səbəb olub.

**Gülnar Süleymanova,**
**Könül Nəzərova**

# "Çanaqqala zəfəri və şəhidləri anma günü" adlı tədbir




Mart ayının 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında Çanaqqala zəfərinin 101-ci ildönümünə həsr edilmiş "Çanaqqala zəfəri və şəhidləri anma günü" adlı tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi ilə yanaşı, Türkiyənin Azərbaycandakı Təhsil müşaviri cənab Abdulqafur Büyükfırat, Türkiyə Əməkdaşlıq və İnkişaf İdarəsinin başqanı cənab Mustafa Haşim Polat da iştirak ediblər. Toplantıda ilk olaraq Çanaqqala şəhidlərinin xatirəsi bir dəqiqəlik sükutla yad edilib, Türkiyənin və Azərbaycanın dövlət himnləri səsləndirilib.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov tədbiri giriş sözü ilə açaraq bildirib ki, bütün Türk dünyasının tarixinə böyük qəhrəmanlıq və hərbi şücaət salnaməsi kimi daxil olmuş Çanaqqala zəfərindən 101 il keçir. Çanaqqala döyüşü Birinci Dünya müharibəsi illərində (1914-1918), daha dəqiq desək, 1915-1916-cı illərdə Osmanlı dövləti ilə İttifaq dövlətləri (İngiltərə, Fransa və s.) arasında dənizdə və quruda aparılan nəhəng bir döyüş olmuşdur. Həmin dövrdə İttifaq dövlətləri Osmanlı dövlətinin paytaxtı İstanbulu işğal edərək boğazları ələ keçirmək və bununla da Rusiya üçün etibarlı bir ticarət və hərbi yol açmaq istəyirdilər. Eyni zamanda onlar Almaniyanın müttəfiqlərindən biri olan Osmanlını zəiflətmək məqsədilə Çanaqqalanı hədəf seçmişdilər. Çünki Çanaqqalanın işğal edilməsi bütünlükdə Osmanlı dövlətinin tamamilə məhv edilməsi demək idi. Yəni bu döyüş faktiki olaraq Osmanlı dövləti üçün bir ölüm-dirim məsələsi idi. İttifaq dövlətləri canlı qüvvə və texnika sarıdan böyük üstünlüyə malik olsalar da, Çanaqqalanı ələ keçirə bilməmiş, döyüş sonucda Osmanlı qüvvələrinin qələbəsi ilə nəticələnmişdir. Məşhur Çanaqqala döyüşü Osmanlı dövlətinin bir möhtəşəm qələbəsi kimi tarixə düşmüş, hər bir vətəndaşın xatirəsində qalmışdır. Çanaqqala zəfəri Türk xalqının, Türk millətinin tarixin ən çətin və mürəkkəb dövrlərində öz gücünü, iradəsini ortaya qoyaraq nələr edə biləcəyini bütün dünyaya göstərmişdir. Bu savaş həm də Türk Qurtuluş Döyüşünə böyük təsir göstərmişdir. Məhz buna görə Türkiyə Respublikası qurulduqdan sonra ingilis və fransız donanmalarının geri çəkilməyə məcbur edildiyi 18 mart tarixi Çanaqqala Şəhidlərini Xatırlama Günü olaraq elan edilmişdir. Düşmən tərəfi olan Antanta birliyi üçünsə bu döyüş hərbi bacarıqsızlıq və fəlakət simvolu olaraq qəbul edilmişdir.



Rektor Y.Məmmədov çıxışı zamanı deyib ki, bu gün bütün Türk dünyasının parlaq hərbi-siyasi istedadından, məharətindən böyük qürur və fəxr duyduğu Mustafa Kamal Atatürk bu döyüşdə öz üzərinə düşən hərbi vəzifələri layiqincə yerinə yetirmişdir. Böyük Mustafa Kamal Atatürkün öz əsgərlərinə «Mən sizə vuruşmağı əmr etmirəm, ölməyi əmr edirəm!» çağırışı Çanaqqala savaşının gedişinə və nəticəsinə böyük təsir göstərmişdir.




Mustafa Kamal Atatürk elə döyüşlərin ilk günlərindən öz parlaq hərbi istedadını üzə çıxarmış və «Anafartalar qəhrəmanı» adı ilə də tanınmış, məşhurlaşmışdır. Bu fakt həm də Mustafa Kamal Atatürkün Türk xalqının milli lideri kimi ortaya çıxmasına həlledici təsir göstərmişdir.

Rektor Y.Məmmədov qeyd edib ki, qardaş Türkiyədə 2015-ci ilin iyul ayından bu günə kimi 5 böyük qanlı terror hadisəsi törədilib. Sonuncu terror aktı mart ayının 13-də Ankara şəhərinin Qızılay meydanında baş verdi. Bu terror nəticəsində 37 nəfər həlak oldu, 125 nəfər yaralandı. Onlardan 15-i ağır yaralıdır. Azərbaycan xalqı həmişə olduğu kimi, yenə də birmənalı şəkildə qardaş Türkiyənin yanında olduğunu göstərdi. Xalqımız bu terror aktını qətiyyətlə pisləyir və bu ağır cinayəti törədənlərə lənətlər yağdırır. Ümummilli liderimiz Heydər Əliyevin dediyi kimi, "Biz bir millət, iki dövlətik". Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev mart ayının 15-də qardaş ölkədə Azərbaycan-Türkiyə Yüksək Səviyyəli Strateji Əməkdaşlıq Şurasının 5-ci iclasında iştirak edərkən bir daha bu sarsılmaz mənəvi-siyasi birliyi ortaya qoydu.

Türkiyənin Azərbaycandakı Təhsil müşaviri Abdulqafur Büyükfırat çıxış edərək Çanaqqala zəfərinin 101-ci ildönümünə həsr edilmiş bu tədbirin təşkil edilməsinə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib, tələbə-gənclərə Vətən tarixini dərindən öyrənməyi, milli ruhlu vətənpərvər vətəndaş kimi yetişməyi tövsiyə edib.

Tədbirdə tələbə-gənclərin hazırladıqları bədii- musiqili kompozisiya təqdim edilib.

**Mənsur Ibrahimli**



# «31 Mart Azərbaycanlıların Soyqırımı Günüdür» mövzusunda elmi-nəzəri konfrans

Mart ayının 31-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) "Heydər Əliyev məktəbinin




lektoriyası"nda Səbail Rayon İcra Hakimiyyətinin (RİH) təşəbbüsü, Yeni Azərbaycan Partiyasının (YAP) Səbail rayon təşkilatının və ADPU-nun birgə təşkilatçılığı ilə "31 Mart Azərbaycanlıların Soyqırımı Günüdür" mövzusunda elmi-nəzəri konfrans keçirilib. Konfransda Səbail RİH-in rəhbərliyi ilə yanaşı, Milli Məclisin üzvləri, YAP-ın Səbail rayon təşkilatının təmsilçiləri, rayonun hüquq-mühafizə orqanlarının məsul vəzifəli şəxsləri, elm, təhsil və din xadimləri, ziyalılar, ağsaqqallar, veteranlar, müəllim və tələbə-gənclər və rayon ictimaiyyətinin nümayəndələri iştirak ediblər.

Səbail RİH-in başçısı Eldar Əzizov konfransı giriş sözü ilə açaraq bildirib ki, Azərbaycan xalqı XX əsrdə bir neçə dəfə soyqırımlara məruz qalıb. Belə ki, uzun illər azərbaycanlıların əzəli torpaqlarına sahib çıxmaq və burada «Böyük Ermənistan» yaratmaq xülyaları ilə yaşayan erməni qəsbkarları 1918-ci ildə Bakı, Şamaxı, Quba qəzalarında, Qarabağda, Zəngəzurda, Naxçıvanda, Lənkəranda və Azərbaycanın başqa bölgələrində minlərlə dinc azərbaycanlı əhalini yalnız milli mənsubiyyətinə görə məhv edib, milli memarlıq incilərini, məktəbləri, xəstəxanaları, məscid və digər abidələri dağıdıblar.

Ötən əsrin 80-ci illərinin sonlarında SSRİ-nin süqutunun sürətlənməsindən istifadə edən ermənilər öz havadarlarının köməyi ilə Dağlıq Qarabağın Ermənistana birləşdirilməsi üçün Azərbaycana qarşı birbaşa hərbi təcavüzə başladılar. 1992-ci ilin fevralında isə Xocalıda azərbaycanlılara qarşı növbəti soyqırımı törədildi, torpaqlarımızın 20 faizi işğal olundu.

Azərbaycan müstəqillik qazandıqdan sonra uzun illər gizli saxlanılan həqiqətlər açıldı, təhrif edilən hadisələr əsl qiymətini aldı. Ümummilli liderimiz Heydər Əliyevin 1998-ci il martın 26-da imzaladığı Fərmanla 31 mart Azərbaycanlıların Soyqırımı Günü elan edildi. Bununla da Azərbaycan tarixində erməni məsələsinə münasibətdə yeni strategiya müəyyənləşdi. Bu, həm də Azərbaycan xalqının əsrlər boyu üzləşdiyi mərhumiyyətlərə verilən əsl tarixi qiymət idi.

Ulu öndər Heydər Əliyevin ideya və əməllərini yaşadan, bütün dünyada müasir və mütərəqqi lider kimi tanınan, bugünkü çətin və mürəkkəb dövrdə müstəqil xarici siyasət yürüdən Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev dövlətçilik maraqlarımızın qorunmasında və ölkəmizin ərazi bütövlüyünün bərpa olunması istiqamətində qəti və prinsipial mövqe nümayiş etdirir. Dövlət başçımızın yorulmaz fəaliyyəti nəticəsində Azərbaycan inkişaf edərək dünyada özünəməxsus layiqli yerini tutub. Qarabağ probleminin həlli istiqamətində mərhələli addımlar atılır, ölkənin iqtisadi gücü artır və siyasi nüfuzu güclənir. Ermənistan isə əksinə, bizim uğurlarımız fonunda daha da zəifləyir.

Səbail RİH-in başçısı E.Əzizov vurğulayıb ki, cənab Prezidentin yürütdüyü bu siyasət yeganə düzgün, alternativsiz və müvəffəqiyyət qazandıracaq siyasətdir və xalqımız bu siyasəti yekdilliklə dəstəkləyir.



Daha sonra çıxış edən ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov, YAP-ın Səbail rayon təşkilatının sədri, Milli Məclisin deputatı, professor Şəmsəddin Hacıyev 1918-ci il hadisələri, eləcə də sonrakı illərdə ermənilərin xalqımıza qarşı həyata keçirdikləri hərbi təcavüz və soyqırımı faktları, onların beynəlxalq ictimaiyyətə çatdırılması istiqamətində görülmüş işlər barədə danışıblar.




Rektor Y.Məmmədov qeyd edib ki, digər milli facilərimiz kimi, ermənilərin öz himayədarlarının köməkliyi ilə 1918-ci ilin martında xalqımıza qarşı törətdikləri soyqırımına da yalnız ümummilli liderimiz Heydər Əliyevin təşəbbüsü və birbaşa rəhbərliyi ilə dolğun və hərtərəfli siyasi-hüquqi qiymət verilmişdir. Ulu öndər Heydər Əliyevin 1998-ci il martın 26-da imzaladığı 690 saylı Fərmanla 31 Mart dövlət səviyyəsində Azərbaycanlıların Soyqırımı Günü elan edilmişdir. Həmin Fərmanla 31 Mart milli faciə günü kimi təqvimimizə daxil olmuşdur. Ulu Öndərimiz həmin Fərmanı imzalayarkən Azərbaycana qarşı beynəlxalq təşkilatlar və dünyanın böyük dövlətləri tərəfindən müəyyən iradlar tutulmuşdu. Yəni həmin qüvvələr Ermənistan-Azərbaycan, Dağlıq Qarabağ münaqişəsi ilə bağlı danışıqların getdiyini əsas gətirərək belə mövqedən çıxış edirdilər. Lakin dahi şəxsiyyət Heydər Əliyev onlara əsaslı arqumentlərlə milli tarixlə siyasəti qarışdırmamağı məsləhət görmüşdü.

Rektor Y.Məmmədov öz çıxışında vurğulayıb ki, insanlığa qarşı törədilən cinayətlərin ən ağırı sayılan soyqırımı probleminin dərindən və hərtərəfli öyrənilməsi mühüm əhəmiyyətə malikdir. Hər bir humanitar faciənin elmi cəhətdən araşdırılması və tarixi faktların dünya ictimaiyyətinə dolğun şəkildə çatdırılması həmin hadisəyə obyektiv siyasi-hüquqi qiymətin verilməsinə, günahkarların layiqli cəzasına çatmasına və gələcəkdə belə halların qarşısının alınmasına həlledici təsir göstərə bilər.

Konfransda ADPU-nun professoru Mais Əmrahov, dosent Elmira Məmmədova, dosent Firudin Cümşüdov, baş müəllim Elman Mirzəyev, baş müəllim Eldar Hacıyev, müəllim Taleh Cəfərov, müəllim Nəbi Əsədov, müəllim Dəyanət Musayev, universitetin doktorantı Xalidə İbrahimova, universitetin magistri Günel Bayramlı, tələbələr Səkinə Rzalı, Aybəniz Bədəlova, Tahir Cabbarlı XX əsrin müxtəlif dövrlərində azərbaycanlıların məruz qaldıqları soyqırımı faktları, ermənilər tərəfindən Azərbaycan torpaqlarının işğalı ilə bağlı uzun illər həyata keçirdikləri planları, Xocalı faciəsi və Ermənistan- Azərbaycan, Dağlıq Qarabağ münaqişəsinin nəticələri ilə bağlı məruzələrlə çıxış ediblər.

Konfransın sonunda edilən məruzələrin xüsusi kitab şəklində buraxılması qərara alınıb və konfrans iştirakçıları adından yekdilliklə bəyanat qəbul olunub.

**"Gənc müəllim"**

# "Sağlam təhsil-sağlam millət" layihəsinin təqdimatı

Mart ayının 10-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında Təhsil Nazirliyinin "Sağlam təhsil-sağlam millət" layihəsinin təqdimatı keçirilib. Təqdimatda ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev, SABAH qruplarının ADPU üzrə koordinator rəhbəri, psixologiya üzrə fəlsəfə doktoru Lalə Mürsəlbəyova, "Sağlam təhsil-sağlam millət" layihəsinin Pedaqoji blokunun rəhbəri Afət Süleymanova, Tibbi blokunun rəhbəri Şəhla Balayeva, Psixoloji blokunun rəhbəri Aynur Bünyatova, Sosial blokunun rəhbəri Nigar Şahhüseynbəyova, SABAH qruplarında tələbələr üzrə menecer Mehriban Nəzərova, Gender bölməsinin rəhbəri Şəhla İsmayılova, "Pedaqoji təhsilin problemləri" elmi-tədqiqat laboratoriyasının müdiri, dosent Gülşən Novruzova, SABAH qruplarında təhsil alan tələbələr və İbtidai təhsil fakültəsinin tələbələri iştirak ediblər.

Tədbiri ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev açaraq "Sağlam təhsil-sağlam millət" layihəsinin Təhsil Nazirliyinin maraqlı, vacib və uğurlu layihələrindən biri olduğunu vurğulayıb, tələbə-gəncləri tədbirdə fəal olmağa səsləyib. Sonra "Sağlam təhsil-sağlam millət" layihəsini əks etdirən videofilm nümayiş etdirilib.

Təqdimatda "Sağlam təhsil-sağlam millət" layihəsinin Pedaqoji blokunun rəhbəri Afət Süleymanova çıxış edərək bildirib ki, məktəbyaşlı uşaqlar vaxtlarının təxminən 25%-ni sinifdə keçirlər. Mövcud təhsil texnologiyalarına əsasən uşaqlar həmin vaxtı sinifdə məhz oturaq vəziyyətdə keçirirlər. Ümumi təhsilini başa vuran yeniyetmələrdə hərəkət məhdudiyyəti fiziki inkişaf, qamət, görmə pozuntuları və digər sağlamlıq problemlərinin yaranmasının əsas səbəblərindən sayılır. Elmi araşdırmalar göstərir ki, bəzi hallarda məktəbi bitirənlərin yalnız 3-4%-i tam sağlam olur. Bu baxımdan, təhsilalanların sağlamlığını qoruyan, təlim və yaradıcılıq nailiyyətlərini yüksəldən təhsil texnologiyalarını özündə birləşdirən "Sağlam təhsil-



sağlam millət" layihəsi mühüm əhəmiyyət kəsb edir. Qeyd edək ki, "Təhsil haqqında" Azərbaycan Respublikası Qanununun 32.3.10.-cu maddəsini (sağlamlıq üçün təhlükəsiz və zərərsiz təhsil şəraiti ilə təmin olunmaq); "Uşaq hüquqları haqqında" Azərbaycan Respublikası Qanununun 8-ci (Uşağın yaşamaq və inkişaf etmək hüququ) və 9-cu maddələrini (Uşağın həyatı və sağlamlığının mühafizəsi hüququ) nəzərə alaraq, təhsilalanların sağlamlığının qorunması və təlim nailiyyətlərinin yüksəldilməsi sahəsində təhsil texnologiyalarının tətbiqi üzrə İşçi Qrupunun yaradılması haqqında Təhsil Nazirliyinin 11 dekabr 2013-cü il tarixli 913 nömrəli əmri ilə "Sağlam təhsil - sağlam millət " layihəsinin tətbiqinə start verilib. Layihənin əsas məqsədi təhsilalanların təlim nailiyyətlərini yüksəltməklə yanaşı, tədris şəraitindən irəli gələn hərəkət məhdudiyyətini və digər amilləri aradan qaldırmaq, onların sağlamlığını qorumaqdır.

Məlumdur ki, təhsilin məqsədi ümumilikdə yüksək təlim və yaradıcılıq nailiyyətlərinə malik mütərəqqi, fiziki-psixi və mənəvi sağlam vətəndaş yetişdirməkdən ibarətdir. "Sağlam təhsil-sağlam millət" layihəsi də bu məqsədin reallaşdırılması üçün həyata keçirilir. Ötən tədris ilindən fəaliyyət göstərən 15 "Sağlam təhsil" sinfində keçirilmiş tibbi monitorinq bu siniflərdə tətbiq olunan texnologiyaların uşaqların sağlamlığına müsbət təsir etdiyini aşkara çıxarıb. Eyni zamanda belə siniflərdə təhsil alan şagirdlərin fiziki və intellektual cəhətdən daha yaxşı inkişaf etdiyi, onların öyrənmə qabiliyyətinin, habelə emosional-psixoloji durumunun yüksəldiyi müəyyənləşdirilib. 2015-2016-cı tədris ilində isə layihə çərçivəsində daha 52 "Sağlam təhsil" sinfi yaradılıb. Hazırda Bakıda 33, Sumqayıtda bir ümumtəhsil məktəbi olmaqla, ümumilikdə 34 təhsil müəssisəsində 67 "Sağlam təhsil" sinfi fəaliyyət göstərir.

"Sağlam təhsil" siniflərində tədris hərəkətli təlim şəraitində həyata keçirilir. Şagird masaları həm oturaraq, həm də ayaqüstə çalışmaq imkanı verir. Bu siniflərdə dərs deyən müəllimlərin maarifləndirilməsi işini daha səmərəli təşkil etmək məqsədilə "Sinif gigiyenası" adlı metodik vəsait hazırlanıb və həmin vəsait müəllimlərə çatdırılıb. Layihəyə tədris və tibb sahələrinin bir çox görkəmli mütəxəssisləri ekspert qismində cəlb ediliblər.

Təqdimat mərasimində həmçinin SABAH qrupları və "Sağlam təhsil-sağlam millət" layihəsinin əməkdaşlığı çərçivəsində ADPU-nun SABAH qruplarında "İbtidai sinif müəllimliyi" ixtisasında təhsil alan III kurs tələbələri üçün təşkil edilmiş təcrübə proqramının da təqdimatı keçirilib. Məlumat üçün bildirək ki, tələbələr fevralın 1-dən-12-dək Bakı şəhərindəki 23, 26, 83, 114 və 214 nömrəli tam orta məktəblərin "Sağlam təhsil sinifləri"ndə pedaqoji təcrübə keçiblər.Təcrübə müddətində layihənin metodistləri, psixoloqu, pedaqoqu, eyni zamanda SABAH qruplarının ADPU üzrə koordinator rəhbəri Lalə Mürsəlbəyova mütəmadi olaraq siniflərə baxış keçirib və gənc müəllimlərə dəstək olublar.

Təcrübə proqramının yekununda tələbələrin planlaşdırdıqları açıq dərsləri izlənilib və onlar əvvəlcədən müəyyənləşdirilmiş tədqiqat mövzuları üzrə təqdimat ediblər. Davamiyyət, ünsiyyət, şagirdlərlə davranış, fəallıq və digər meyarlar üzrə metodist, psixoloq, sosioloq və sərbəst müşahidəçilər tərəfindən qiymətləndirilən tələbələr sonda Təhsil Nazirliyinin və Milli Təhsil Texnologiyaları Mərkəzinin sertifikatını əldə ediblər.

Tədbirin sonunda tələbə-gənclərin layihə ilə bağlı müxtəlif sualları cavablandırılıb.

**Gülnar SÜLEYMANOVA,**
**Könül NƏZƏROVA**



# "Kaspi" Təhsil Şirkətinin "Kaspi Təcrübə Proqramı"nın təqdimatı

Mart ayının 14-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) kiçik akt zalında "Kaspi"Təhsil Şirkətinin "Kaspi Təcrübə Proqramı"nın təqdimatı keçirilib. ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev tədbiri giriş sözü ilə açaraq bildirib ki, "Kaspi" Təhsil Şirkəti ölkəmizin tanınmış, qabaqcıl və nüfuzlu təhsil şirkətlərindən biridir. Hazırda "Kaspi" Təhsil Şirkəti öz nəzdində fəaliyyət göstərən təhsil mərkəzləri və liseyləri peşəkar müəllim heyəti ilə təmin etmək məqsədilə ali təhsilin bakalavriat pilləsinin IV və magistratura pilləsinin I və II kurslarında pedaqojiyönümlü təhsil alan tələbələr üçün "Kaspi Təcrübə Proqramı"nı həyata keçirir. Bu proqram maraqlı və vacib bir proqramdır. ADPU-da keçirilən bu təqdimatın əsas məqsədi də tələbə-gəncləri







"Kaspi Təcrübə Proqramı" ilə tanış etmək və onları bu proqram barədə məlumatlandırmaqdır.

"Kaspi" Təhsil Şirkətinin İnsan resursları şöbəsinin mütəxəssisi Həvayət Quliyeva çıxış edərək təqdimatın təşkil edilməsinə göstərdiyi köməkliyə görə ADPU-nun rəhbərliyinə təşəkkür edib. Həvayət Quliyeva bildirib ki, "Kaspi" Təhsil Şirkəti 2007-ci ildən fəaliyyət göstərir. Gənclərə mükəmməl milli təhsil verməyi qarşısına əsas məqsəd qoyan şirkətin hazırda 2 liseyi, 9 təhsil mərkəzi və 2 uşaq bağçası var. Bakı şəhəri ilə yanaşı, şirkətin Gəncə və Sumqayıt şəhərlərində də təhsil mərkəzləri fəaliyyət göstərir.

"Kaspi" Təhsil Şirkətinin İnsan resursları şöbəsinin mütəxəssisi Lalə Ələkbərli çıxış edərək "Kaspi Təcrübə Proqramı"nın mahiyyəti və xüsusiyyətləri barədə məlumat verib. Lalə Ələkbərli bildirib ki, bu, şirkət tərəfindən həyata keçirilən sayca 4-cü təcrübə proqramıdır. Aprel-may aylarını əhatə edəcək proqram "Kaspi" Təhsil Şirkətinin bağça, lisey və təhsil mərkəzlərində həyata keçiriləcək. Təcrübə proqramı Azərbaycan dili və ədəbiyyatı, riyaziyyat, kimya, fizika, coğrafiya, biologiya, tarix, ingilis dili, rus dili, ibtidai sinif və məktəbəqədər təhsil ixtisaslarını əhatə edəcəkdir. Bu proqramda iştirak edən tələbələr "Kaspi" təhsil mərkəzlərində və liseylərində yüksəkixtisaslı müəllimlərin nəzarəti altında təcrübə keçərək peşəkar bacarıqlarını artırmaq imkanı əldə edəcəklər. Tələbələr təcrübə müddətində müxtəlif təlimlər keçəcəklər. Təcrübəçilərin şirkət tərəfindən günorta yeməyi və yol xərcləri ilə təmin edilməsi nəzərdə tutulur. Təcrübə proqramının sonunda iştirakçılar sertifikatla təltif olunacaqlar. Proqramı uğurla başa vuran tələbələrə isə şirkətdə daimi pedaqoji fəaliyyətlə məşğul olmaq imkanı yaradılacaqdır.

Təqdimatda tələbə-gənclərin təcrübə proqramı ilə bağlı sualları da cavablandırılıb.

**"Gənc müəllim"**

# ADPU-nun Şamaxı filalında 8 Mart-Beynəlxalq Qadınlar Günü münasibətilə tədbir keçirilib

Mart ayının 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı filalında Tələbə Gənclər Təşkilatının təşəbbüsü və təşkilatçılığı ilə 8 Mart-Beynəlxalq Qadınlar Günü münasibətilə tədbir keçirilib.

Tələbələrdən Həbibullah Usmanlının və Aytən Ələkbərovanın hazırladıqları səhnəcik, qızlardan ibarət qrupun musiqi kompozisiyası, Nicat Məmmədovun "Ana" şeiri tədbiri daha da təsirli və canlı edib. Qızlardan ibarət rəqs qrupu isə rəq-



sin sonunda müəllimləri gül dəstələri ilə təbrik ediblər. Tədbir iştirakçıları bütün musiqi nömrələrini alqışlarla qarşılayıblar.

Tədbirdə ADPU-nun Şamaxı filialının direktoru, filologiya üzrə fəlsəfə doktoru Tünzalə Yusifova çıxış edərək bütün Azərbaycan qadınlarını, həmçinin filialın xanım əməkdaşlarını, tələbə xanımlarını 8 Mart-Beynəlxalq Qadınlar Günü münasibətilə təbrik edib, onlara həyatda cansağlığı, xoşbəxtlik və uğurlar arzulayıb.

Tələbələr də ADPU-nun Şamaxı filialının qadın əməkdaşlarını və onların simasında bütün Azərbaycan qadınlarını təbrik edib, onlara cansağlığı və işlərində uğurlar arzulayıblar.

# ADPU-nun Qazax filialında 8 Mart - Beynəlxalq Qadınlar Gününə həsr edilmiş tədbir keçirilib

Mart ayının 7-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Qazax filialında 8Mart-Beynəlxalq Qadınlar Gününə həsr edilmiş tədbir keçirilib. ADPU-nun Qazax filialının direktoru, dosent Afaq Qasımova tədbiri giriş sözü ilə açaraq bütün qadınları 8 Mart-Beynəlxalq Qadınlar Günü münasibətilə təbrik edib, onlara cansağlığı, uzun ömür, qadın xoşbəxtliyi, peşə fəaliyyətlərində uğurlar arzulayıb. Eyni zamanda ADPU-nun Qazax filialının Azərbaycan dili və ədəbiyyatı kafedrasının müdiri İradə Arıxova filialın kollektivi adından Afaq xanımı təbrik edib, ona həyatda və elmi-pedaqoji fəaliyyətində yeni-yeni uğurlar arzulayıb.

# Nitq mədəniyyəti barədə - III yazı



Emosionallıqdan yaranan stresi gəzmək yolu ilə yüngülləşdirdiyimiz və aradan qaldırdığımız kimi, musiqi ilə də qaydaya sala bilərik. Bu mənada Musoqskinin "Sərgidən lövhələr" əsəri emosional stresdən qurtarmağa effektli təsir göstərir. Bundan başqa, nevroz və əsəbilikdən qurtulmaq üçün Çaykovskinin "Romeo və Cülyetta" baletindəki uvertüra-fantaziyasını dinləmək lazımdır. Baş ağrılarını götürmək üçün Ohinskinin "Polonez" və Ştrausun valslarını dinləmək məsləhət bilinir. Belə hesab olunur ki, insanda yuxunu normallaşdıran, yuxunu gətirən musiqi əsərləri vardır. Məsələn, Qriqin "Per Qunt", Massnın "Meditasiya", Offenbaxın "Barkalola", Mendelsonun "Sözsüz mahnı", Nyu Eycin "Yeni əsr" əsərləri insan orqanizmindəki musiqi toxumalarını quş cəhcəhi, yağış səsi, ləpədöyən səsi ilə doydurur. Mendelsonun "Toy marşı", Debüssinin, Ravelin əsərləri, eləcə də klassik hind musiqiləri qan təzyiqini və ürəyin fəaliyyətini qaydaya salır. Musiqi insanın əhval-ruhiyyəsini yaxşılaşdırır, baş beynin pozulmuş ritmini qaydaya salır. Bu baxımdan XVII-XVIII əsr musiqiçiləri Bax, Bokkerini, Teleman, Vivaldi, Qaydn, Hendelin və digərlərinin musiqiləri əvəzsizdir. (bax: Musiqi ilə rahatlıq. - "Kaspi" qəzeti, 11 iyun 2015-ci il, 104 (3418), s.16)

Səs hər bir canlıya mənfi və müsbət təsir götərə bilir. Belə hesab olunur ki, gülün elə növü var ki, onun yanında yaxşı danışmayanda, xoş söz deməyəndə o inciyir, küsür. Ancaq xoş söz, yaxşı münasibət həmin gülün fəaliyyətini daha da gücləndirir.

Araşdırmalar onu da təsdiq edir ki, danışıq səslərinin orqanizmə təsiretmə imkanlar var. (bax: İlham Cəmiloğlu. Səsin orqanizmə möcüzəvi təsiri - səs terapeyası. - Modern.az saytı, 25.06.2015-ci il) Məsələn, "i" səsinin tələffüzü burun yollarını təmizləyir, gözləri mülaicə edir. "U" səsinin tələffüzü boğaz və səs tellərinə müsbət təsir edir. "V", "n", "m", "e" səslərinin tələffüzü beynin fəaliyyətini yaxşılaşdırır. "K" səsinin tələffüzü eşitmə qabiliyyətini gücləndirir. "X", "ç" səslərinin tələffüzü tənəffüz sisteminə yaxşı təsir göstərir, nəfəsalmanı asanlaşdırır. "O", "a", "s" səslərinin tələffüzü ürək xəstəliklərini müalicə edir.

Hər bir ictimai mahiyyətli danışıq səsinin məxrəci var. Danışıq səsləri bir-birindən öz səs məxrəclərinə görə fərqlənir. Ona görə də yaxın səs məxrəcində olan danışıq səslərini elə dəqiq və düzgün tələffüz etmək lazımdır ki, onların səs məxrəci bir-birinə qarışmasın. Səs məxrəcinin qarışması ictimai mahiyyətli danışıq səslərini bir-biri ilə qarışdıra bilər. Bəzən danışıq səslərini düzgün tələffüz etməyənlər səslərin məxrəcini bir-biri ilə qarışıq salırlar. Bəzən isə danışıq səslərini düzgün tələffüz edə bilmirlər. Bunlar da səsin dəqiq, düzgün çatdırılmasına maneçilik göstərir, danışıq səsinin özünün ictimai mahiyyətinə xələl gətirir. Bu da nitqin mədəniliyinə ziyan vurur. Hətta yazıda da bir hərfin düzgün işlənməməsi oxucuda çaşqınlıq yarada bilir. Vaxtilə Cəlil Məmmədquluzadə belə halları məsxərəyə qoyur və tənqid edirdi. O, "Dil" adlı felyetonunda yazır: "Mən indiyə kimi inciyərdim o müsəlmanlardan ki, öz dillərini bilə-bilə bir-birinə rus dilində məktub yazırlar. Amma indi incimirəm". (bax: Cəlil Məmmədquluzadə. Dil. - Buludxan Xəlilov. Azərbaycan dili antologiyası. Bakı, "Bakı Çap Evi" nəşriyyatı, 2013, s.135) Cəlil Məmmədquluzadə öz dillərini bilə-bilə rus dilində məktub yazan müsəlmanlardan ona görə incimirdi ki, onlar öz dillərində yazanda da, oxuyanda da səhvlərə yol verirdilər. Məsələn, Molla Cəfər elə bilir ki, məktubda "Fatmanın oğlu oldu" əvəzinə "Fatmanın oğlu öldü" yazılıbdır. "Dil" felyetonunda yazılır: "Bacım Fatma da hamilə idi və doğmağına bir neçə gün qalanda əri İsmayıl böylə gəldi İravana. Uşağı Russo həkim müalicə eləyirdi. Fatma doğdu və bir oğlu oldu. Bir gün keçəndən sonra poçta yolum düşdü və bir açıq kağız alıb kəndimizə Molla Cəfər rəfiqimizə müxtəsər yazdım: "Anama de ki, Fatmanın oğlu oldu". Kağızı saldım qutuya.

Molla Cəfər kağızı alır və elə bilir ki, mən yazmışam "Fatmanın oğlu öldü, yeni vəfat elədi; çünki molla bunu bilirmiş ki, bacım İrəvana gəlib naxoş oğluna müalicə elətdirsin və hamilə olmağını ya bilmirmiş, ya xəyalında deyil imiş. Əvvəl Molla Cəfər istəmir bu cür pis xəbəri anama yetirsin, hətta məndən narazı olub ki, qoca övrətə mən niyə bu tövr qəmli xəbəri yazıram.

Xülasə, üç gün keçəndən sonra, evdə oturmuşduq, gördük qapı döyülür və bir övrət ağlayır. Qapı açılan kimi biçarə anam "bala vay!" deyib, özünü çırpdı yerə və bihuş oldu.

Mən o saat işi duydum və bacımın böyük oğlunu və təzə doğduğu uşağı da gətirib qoyduq anamın qucağına. Handanhana yazıq övrət gözlərini açdı və başladı uşaqların ikisini də öpüb qucaqlamağa.

- Allah Molla Cəfərə insaf versin!" (bax: Cəlil Məmmədquluzadə. Dil. - Buludxan Xəlilov. Azərbaycan dili antologiyası. Bakı, "Bakı Çap Evi" nəşriyyatı, 2013, s.136) Allah səsi, sözü, cümləni düzgün işlətməyənlərə də insaf versin. Onlar dilimizə xələl gətirirlər. Ana dilimizin qayda-qanunlarını pozurlar. Vaxtilə Firidun bəy Köçərli (1913-cü ildə) "Ana dili" məqaləsində yazırdı: "Allah Əli bəy Hüseynzadəyə insaf versin. Kaş o alicənab İstanbulda rahat əyləşib, bizim şumbəxt Qafqaza təşrif gətirməyə idi. O cənabın elm və kamalına sözümüz yoxdur. Sözümüz ondadır ki, elm və kamalından bizə bir bəhrə vermədi, ancaq dilimizə pozğunluq saldı, təzə dil gətirdi" (bax: Firidun bəy Köçərli. Ana dili. - Buludxan Xəlilov. Azərbaycan dili antologiyası. Bakı, "Bakı Çap Evi" nəşriyyatı, 2013, s.117)

Səs və onun təsir imkanları o qədər genişdir ki, onun sehrindən çıxmaq mümkün deyildir. Yaxşı mühazirə söyləyənlər, həm də yaxşı səs temprinə malik olublar. Məsələn, professor Əli Sultanlı kimi. Ona görə də Əli Sultanlının səsi həmişə onun tələbələrinin qulağında səslənibdir. Bu mənada İsmayıl Şıxlı yazır: "Əli müəllim sinfə girərdi. Biz dəftər-qələmi hazırlayıb onun dediklərini qeyd etmək istərdik. Ancaq mühazirə başlanan kimi hər şeyi unudar, bir də o vaxt ayılardıq ki, zəng çalınır.

Axşamlar yataqxanada toplaşardıq. Çalışardıq ki, Əli müəllimin mühazirəsini hafizəmizdə canlandırıb dəftərə köçürək. Bu işdə tələbə yoldaşımız Baxşəli bizə çox kömək edərdi. (Onun olduqca iti hafizəsi və böyük artistlik istedadı vardı. "Vaqif" əsərinə bircə dəfə baxdıqdan sonra pyesi əzbər öyrənmişdi.) O eyni ilə, Əli müəllim kimi, onun səsini və hərəkətlərini yamsılayaraq, sinifdə eşitdiyi mühazirəni təkrar edərdi, biz isə dəftərə köçürərdik. Bundan sonra yataqxananın həyətində, otaqlarda, Əli Sultanlının təqlidçiləri fəaliyyətə başlayırdı". (bax: Buludxan Xəlilov. İsmayıl Şıxlının dilçilik görüşləri. Bakı, "Bakı Çap Evi", nəşriyyatı, 2014, s.46-47)

Səs mühazirəçini, natiqi dinləyiciyə sevdirə bilir və nəticədə onun söylədikləri dinləyici tərəfindən xoş əhval-ruhiyyə ilə qəbul olunur.

Dünyada insan səsi qədər təbii, şehrli və möcüzəli başqa bir səs yoxdur. İnsan səsinin qeyri-adiliyi imkan verir ki, o, təbiətdəki və cəmiyyətdəki digər səsləri təqlid edə bilsin. İnsan səsinin imkanlarını heç nə ilə müqayisə etmək mümkün deyil. Bizim hər birimiz insan səsinin imkanları hesabına - qeyri-adiliyi, sehri, möcüzəsi hesabına Nizaminin, Füzulinin, Cəfər Cabbarlının, Səməd Vurğunun, Rəsul Rzanın, Bəxtiyar Vahabzadənin və digərlərinin şeirlərini sevmişik. Görkəmli aktyorların ifasında biz həmin şeirləri sevə-sevə, həm də Azərbaycanımızı, dilimizi, milli varlığımızı sevmişik. Və bir vətəndaş kimi yetişmişik. Ana dilini, doğma dilini sevməyən hər hansı bir aktyor, yaxud bədii qiraət ustası hər hansı bir bədii parçanı da sevdirə bilməz. Gərək səs tonu ilə, səs avazı ilə hər hansı bir sözü sevdirməyi bacarasan. Salam verməyin də, salam almağın da, sağollaşmanın da bütün gözəlliklərini duymaq və qarşı tərəfə çatdırmağı bacarmaq lazımdır.

**Buludxan Xəlilov,**
**Filologiya fakültəsinin dekanı,**
**filologiya üzrə elmlər doktoru,**
**professor**

# Cəlil Məmmədquluzadənin "Ölülər" əsəri əsasında səhnələşdirilmiş eyniadlı tamaşanın nümayişi

Mart ayının 4-də Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun dəstəyi ilə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük Akt zalında universitetin professor-müəllim heyəti və tələbələri üçün Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin (ADMİU) IV kurs tələbələrinin xalqımızın böyük yazıçı-dramaturqu, mütəfəkkiri, publisisti, ictimai xadimi Cəlil Məmmədquluzadənin "Ölülər" əsəri əsasında səhnələşdirdikləri eyniadlı tamaşa nümayiş etdirilib. Tamaşadan öncə ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Fikrət Rzayev çıxış edərək "Ölülər" əsərinin dərin məna və məzmun kəsb etməsindən, yüksək ideya-bədii xüsusiyyətlərə malik olmasından və müasir dövrümüzlə səsləşməsindən danışıb. Azərbaycan Respublikasının Prezidenti yanında Bilik Fondunun aparıcı məsləhətçisi Ramilə Qurbanlı çıxış edərək ADPU-nun rəhbərliyinə tamaşanın nümayiş etdirilməsi üçün göstərdiyi köməyə görə təşəkkür edib. Qeyd edək ki, "Ölülər" tamaşasının quruluşçu rejissoru, ADMİU-nun dosenti, tamaşanı hazırlayan kursun və ADPU-nun Dram dərnəyinin rəhbəri Məmməd Səfadır.



Görkəmli yazıçı C.Məmmədquluzadənin 1909-cu ildə yazdığı, Azərbaycan dramaturgiyasının nadir və bənzərsiz nümunəsi olan "Ölülər" tragikomediyası cəhalət və mövhumat əsarətindən xilas üçün son dərəcə dərin təsir gücünə malik bir əsərdir. Məlumat üçün onu da bildirək ki, "Ölülər" əsəri ilk dəfə 1916-cı ildə Bakıda tamaşaya qoyulub.



"Ölülər" əsəri bütövlükdə Türk-müsəlman dünyasında, o cümlədən Azərbaycanda mənəvi buxovları, əsarəti, nadanlığı, cahilliyi, mənəvi tənəzzülü və dini fanatizmi böyük cəsarətlə ifşa edən dahiyanə əsərdir. Əsərdəki kefli İskəndər obrazı XX əsrin əvvəllərində Azərbaycan cəmiyyətində nəzərə çarpan milli ziyalı təbəqəsinin ümumiləşdirilmiş obrazıdır. Ali təhsil almış, müasir dünyagörüşə malik olan İskəndər ətrafında baş verən hadisələri dərindən dərk edir və bütün bunları həmvətənlərinə çatdırmaq, onların gözünü açmaq üçün cəhd göstərir. Lakin dini fanatizmin dərin girdabına düşmüş "şəhər əhli" onu anlamaq, başa düşmək səviyyəsində deyil. Atası Hacı Həsən, anası Kərbəlayı Fatma xanım, şəhər sakinləri Məşədi Oruc, Məşədi Baxşəli, Hacı Kərim, Hacı Kazım, Mir Bağır ağa kimi "diri ölülər" İskəndərə dəli kimi baxır, onun adamları "ölü diriltmək" adı ilə yoldan çıxaran, aldadıb namusunu və şəxsiyyətlərini tapdalayan fırıldaqçı və dələduz Şeyx Nəsrullahın iç üzünü açan, onu ifşa edən təsirli sözlərinə inanmaq istəmirlər.

Şeyx Nəsrullah obrazı ilə "Ölülər" əsərində bütövlükdə yalançı, riyakar, fırıldaqçı din xadimlərinin əməlləri ümumiləşdirilir. Çox təəssüflər olsun ki, onun "ölü diriltmək" oyunu müəyyən mənada baş tutur. Lakin böyük çətinliklərlə olsa da, nəhayət, İskəndər qatı fanatizmlə mübarizədə qalib gələrək Şeyx Nəsrullahı ifşa edə bilir. Yazıçının əsas qayəsi İslam dinini Şeyx Nəsrullah kimi fırıldaqçılardan, kələkbazlardan qorumaqdır.

Yeri gəlmişkən qeyd edək ki, "Ölülər" əsərindəki qəbiristanlıq səhnəsi böyük yazıçı-mütəfəkkir C.Məmmədquluzadənin dahiyanə şəkildə düşünüb kəşf etdiyi dramatik məqamdır. Bu təsirli və ürəkparçalayan səhnə müsəlman cəmiyyətindəki dini fanatizmi və cəhalətin ən acı, ən eybəcər təzahürlərini meydana çıxarır. Əsərdə İskəndərin bacısı Nazlı və qardaşı Cəlal yeni nəsli təmsil edir, dilmanc Əli bəylə teleqrafçı Heydər ağa kimi epizodik obrazlar isə ötən əsrin əvvəllərində yenicə formalaşmaqda olan yerli ziyalı qüvvələrin bəzi əlamətlərini əks etdirirlər. "Ölülər" əsərinin əsas qəhrəmanı olan kefli İskəndərin monoloqu böyük vətənpərvər yazıçı C.Məmmədquluzadənin əsərdə çatdırmaq istədiyi bütün fikir və düşüncələri ifadə edir. İskəndərin Azərbaycan ədəbiyyatında dərin məzmunlu, ən təsirli və ibrətamiz olması ilə seçilən bu məşhur monoloqu təkcə "tarix kitabına qanla yazılmış səhifə" olaraq qalmır, hər dəfə səhnədə səsləndikcə hər dövrün özünəməxsus canlı ölülərini "diri-diri dəfn etmək" imkanına malik silahdan daha kəsərli, daha təsirli ittihamnamə kimi səslənir: "Baxın! Baxın! Yaxşı baxın!" Diqqətnən baxın! Sizin tarixlərinizin bu, qan ilə yazılmış bir səhifədir. Sizdən sonra gələnlər bu kitabı vərəqləyib, bu səhifəni görəndə sizi yada salıb deyəcək: tuf sizin üzünüzə!"

"Ölülər" tamaşası universitetin professor-müəllim heyətinin və tələbə-gənclərinin marağına səbəb olub.

**Gülnar BƏXTIYARQIZI,**
**Könül NƏRIMANQIZI**

# ADPU-nun Zaqatala filialında 8 Mart - Beynəlxalq Qadınlar Gününə həsr olunmuş tədbir keçirilib

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Zaqatala filialında 8 Mart-Beynəlxalq Qadınlar Gününə həsr olunmuş tədbir keçirilib. Tədbirdə ADPU-nun Zaqatala filialının direktoru, professor Orucəli Rzayev çıxış edərək Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Yeni Azərbaycan Partiyasının Sədr müavini, millət vəkili, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyevanın şəxsində bütün Azərbaycan qadınlarını, eləcə də ADPU-nun Zaqatala filialının xanım əməkdaşlarını və tələbə xanımlarını 8 Mart-Beynəlxalq Qadınlar Günü münasibətilə təbrik edib, onlara cansağlığı, səadət, xoşbəxtlik, həyatda və işlərində yeni-yeni uğurlar arzulayıb. Professor O.Rzayev çıxışında qeyd edib ki, ulu öndər Heydər Əliyevin layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin uzaqgörən və mütərəqqi siyasəti nəticəsində Azərbaycan qadını ölkəmizin ictimai-siyasi, sosial-iqtisadi və elmi- mədəni həyatında fəal iştirak edir. Azərbaycan qadınının cəmiyyətimizdə qazandığı yüksək mövqe, elm və təhsildə, mədəniyyətdə qazandığı böyük uğurlar xalqımız tərəfindən yüksək qiymətləndirilir və təqdir edilir.



Tədbirdə digər çıxış edənlər də Azərbaycan qadınının yüksək mənəvi-əxlaqi keyfiyyətlərə, müsbət xüsusiyyətlərə malik olmasından qururla danışaraq qadınların həyatımızdakı və cəmiyyətimizdəki roluna böyük dəyər veriblər.

# Sizi tez itirdik, Bəhruz müəllim!..

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) professor-müəllim və tələbə kollektivinin yaxşı tanıdığı dostumuz Bəhruz Məhəmməd oğlu Nəsirov haqqında keçmiş zamanda danışmaq olduqca çətindir. Sakit təbiəti, gülümsər çöhrəsi, haysız-küysüz danışığı, səmimiyyəti, xeyirxahlığı, təvazökarlığı, zəhmətsevərliyi və geniş elmi erudisiyası ilə hamının sevimlisinə çevrilmişdi. Rahat və mülayim adam idi, on il bir yerdə işlədik, bir tələbənin və ya müəllimin ondan narazılığını hiss etmədim. Tələbələri öz övladları kimi sevirdi, onlara qarşı həssas və diqqətcil idi. Problemləri olan tələbələrə himayədarlıq və kömək etməkdən zövq alırdı. Dünya malına etinasız və nəfsi tox adam idi. Paxıllıqdan, dedi-qodudan, şan-şöhrətdən uzaq idi. İncə yumor hissinə malik idi. Yüksək elmi səviyyəli pedaqoq-alim idi. Amma yazmağı yox, danışmağı, mühazirə oxumağı daha çox sevərdi. Mülki tarixi, ədəbiyyat tarixini, fəlsəfə tarixini yaxşı bildiyinə görə pedaqogika tarixi ilə bağlı mühazirələri daha canlı və maraqlı olurdu. Pedaqoji fakt və hadisələri dövrün ictimai-siyasi hadisələri fonunda elə təqdim edirdi ki, sanki özü də həmin dövrdə yaşayıb. Zəhmətkeş olduğu qədər də əzabkeş idi. Əzablı-əziyyətli günləri çox olmuşdu. Enişli-yoxuşlu yollarda həyat onu çox sınağa çəkmişdi. Gülümsər üzünün çökəklərində, alnındakı qırışlarda, gözünün dərinliklərində özü boyda kədər yükü vardı. Dərdi, kədəri, nisgili çox olsa da, onu bölüşməyi sevməzdi. Özünü elə aparırdı ki, sanki dünyanın xoşbəxtidir. Türkçülüyün vurğunu olduğundan içində şücaəti ilə tarix yaradan əzəmətli bir türk ruhu vardı. Dediyinə görə, ulu babaları da yüzilliklər öncə Türkiyədən gələrək Göyçayda, Qaramanda yurd-yuva salıb, ev-eşik sahibi olmuşdular. Bəzi alimlər qaramanlı soyunun, həqiqətən də, Anadoludan, Qaraman bəyliyindən gəldiyini yazırlar.

Bəhruz Nəsirov 23 aprel 1957-ci ildə Göyçay rayonunun Qaraman kəndində anadan olmuşdu. Orta təhsilini doğma kəndlərində almış, arzularının qanadında Bakıya gəlmişdi. Ən böyük arzusu tarix müəllimi olmaq idi. Bu məqsədlə də sənədlərini Azərbaycan Dövlət Pedaqoji İnstitutunun (indiki ADPU) Tarix fakültəsinə vermişdi. 70-ci illərdə ADPİ-nin Tarix fakültəsinə qəbul olunmaq olduqca çətin bir iş idi. Bu fakültəyə daxil olmaq istəyənlərin əksəriyyətinin arzusu heç də tarix müəllimi olmaq deyildi. Məzunlar daha çox partiya və sovet orqanlarında, hüquq-mühafizə orqanlarında çalışmaq istəyirdilər. Mən özüm də 1978-ci ildə həmin fakültəyə daxil olmaq arzusu ilə Bakıya gəlmişdim, lakin fikrimdən daşındım. Bəhruz isə arzusundan əl çəkmir və Tarix fakültəsinin tələbəsi olmaq sevincini yaşayır. Dördillik tələbəlik həyatı (1975-1979-cu illər) onun ömründə silinməz izlər buraxır. Müəllimlərinin və tələbə yoldaşlarının sevimlisinə çevrilir. Tələbə elmi məclislərində boy göstərir, maraqlı və məzmunlu məruzələrlə çıxış edir, ilkin tədqiqatçılıq qabiliyyətinə yiyələnir. İnstitutu bitirərək təyinatla doğma rayonlarına gəlir, iki il burada tarix müəllimi kimi fəaliyyət göstərir. Elmi işlə məşğul olmaq məqsədilə yenidən doğma instituta qayıdır. ADPİ-nin Ümumi pedaqogika kafedrasının pedaqogika tarixi və nəzəriyyəsi ixtisası üzrə əyani aspiranturasına qəbul olur. Görkəmli alim, akademik Hüseyn Əhmədovun elmi rəhbərliyi ilə "Mahmud bəy Mahmudbəyov Azərbaycanda təhsilin demokratikləşdirilməsi və təlimin ana dilində aparılması uğrunda mübarizədə" mövzusunda namizədlik dissertasiyası üzərində çalışır. Bakı və Leninqrad (indiki Sankt-Peterburq) şəhərlərindəki arxivlərdə araşdırmalar aparır, XX əsrin əvvəllərində Azərbaycanda təhsilin demokratikləşdirilməsi və təlimin ana dilində aparılması uğrunda mübarizədə Mahmud bəy Mahmudbəyovun göstərdiyi fədakarlıqları ilk mənbələr əsasında təhlil və təqdim edir, dəyərli elmi əsər ərsəyə gətirir. Qeyd edək ki, həmin illərdə Azərbaycanda pedaqoji elmlər üzrə dissertasiya müdafiə etmək müşkül işə çevrilmişdi. Çünki İrəvandan və Tbilisidən fərqli olaraq Bakıda pedaqoji elmlər üzrə Dissertasiya Şurası fəaliyyət göstərmirdi. Bu da təbii ki, milli elmi-pedaqoji kadr hazırlığına ciddi zərbə vururdu. Dissertasiya işini vaxtından əvvəl yazıb müdafiəyə təqdim edən gənc tədqiqatçılar İrəvanın və Tbilisinin pedaqoji institutlarında dissertasiyalarını müdafiə etmək üçün illərlə növbə gözləyirdilər.



XX əsrin 80-ci illərinin ikinci yarısında Azərbaycanda pedaqogika tarixi və nəzəriyyəsi və fənlərin tədrisi metodikası ixtisasları üzrə üzrə elmi-pedaqoji kadr hazırlığında yeni bir mərhələ başladı. SSRİ AAK-ı ADPİ-nin nəzdində pedaqogika tarixi və nəzəriyyəsi, fənlərin tədrisi metodikası ixtisasları üzrə Müdafiə Şurasının təşkilinə icazə verdi. Müdafiə Şurasının sədri ADPİ-nin o zamankı rektoru, görkəmli dilçi alim, professor Afad Qurbanov, elmi katib isə Ümumi pedaqogika kafedrasının dosenti, pedaqoji elmlər namizədi İramin İsayev idi. Uzun müddət idi ki, Azərbaycanda pedaqogika tarixi və nəzəriyyəsi və fənlərin tədrisi metodikası ixtisasları üzrə Müdafiə Şurası fəaliyyət göstərmirdi. Azərbaycanlı tədqiqatçılar yaranmış əlverişli şəraitdən maksimum istifadə etməyə çalışırdılar. Yeri gəmişkən qeyd edək ki, 3 il fəaliyyət göstərən həmin şurada 92 nəfər tədqiqatçı öz dissertasiya işlərini müdafiə etmişdi. Bəhruz müəllimin də əsəri Ümumi pedaqogika kafedrasında müzakirə olunmuşdu, müdafiəyə buraxılmışdı. Rəsmi opponentlər və aparıcı təşkilat müəyyən olunmuşdu. Müdafiə gününə çox az vaxt qalırdı. Həmin vaxt mən hərbi xidmətdən yenicə gəlmişdim. İsti yay günlərindən biri idi. Əyani aspiranturaya daxil olub hərbi xidmətə getdiyimdən Bəhruzu tanımırdım. İlk dəfə onu kafedrada gördüm, Vəzirxan Zərbəliyevlə birlikdə rəsmi opponentlərin və aparıcı təşkilatın iradlarına cavabları hazırlayırdılar. Bəhruz iradlara cavabları deyir, Vəzirxan isə yazırdı. (Rəhmətlik Vəzirxanın nədənsə əlləri əsirdi, xətti o qədər də yaxşı deyildi. Az sonra məlum oldu ki, gizli xəstəlik keçirirmiş. O, da öz dissertasiya işini müdafiə etdikdən az sonra dünyasını dəyişdi. Allah ona da rəhmət eləsin!).Vəzirxan məni görən kimi dedi: gəl otur, cavabları yaz. Bəhruz cavabları dedi, mən də yazdım. İlk tanışlığımız belə başladı. O, elmi əsərini uğurla müdafiə etdi. Dissertasiyanın rəsmi opponentləri, Elmi Şuranın üzvləri olan tanınmış pedaqoq-alimlər professor Yusif Talıbov, professor Əliheydər Həşimov, professor Aben Kərimov, dosent Əjdər Ağayev və başqaları əsəri yüksək dəyərləndirdilər. O zaman müdafiə şuralarının yekun qərarını SSRİ Nazirlər Soveti yanında fəaliyyət göstərən Ali Attestasiya Komissiyası təsdiq edirdi. Az sonra Moskvadan gələn teleqram Bəhruza dünya boyda sevinc bəxş etdi. O, pedaqoji elmlər namizədi (indi fəlsəfə doktoru) alimlik dərəcəsi aldı. Bir müddət Ümumi pedaqogika kafedrasının nəzdindəki "Şagirdlərin peşəyönümü" elmi-tədqiqat laboratoriyasında çalışdı, sonra İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasına dəyişdirildi. Həmin vaxtlar kafedraya tanınmış pedaqogika tarixçisi, dosent Əyyub Tağıyev rəhbərlik edirdi. Bəhruzun işlədiyi kafedra ADPU-nun Bakıxanov küçəsindəki 2 saylı tədris korpusunda yerləşdiyindən az-az görüşərdik. Tale elə gətirdi ki, 2007-ci ildə onun işlədiyi Pedaqoji fakültəyə dekan vəzifəsinə seçilmək üçün sənəd verdim. Namizədliyim İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasında müzakirə edilməli idi. İclasın sədri Bəhruz müəllim olmuşdu. Haqqımda o qədər səmimi sözlər demişdi ki... On ilə yaxın bir yerdə işlədik. 1987-ci ildə namizədlik dissertasiyası müdafiə etsə də, hələ dosent elmi adı yox idi. Qısa bir müddətdə dosent vəzifəsinə seçildi, az sonra Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyası onun dosent elmi adını təsdiq etdi. Sonra mənim təşəbbüsümlə "Pedaqoji təhsilin problemləri" elmi-tədqiqat laboratoriyasına müdir vəzifəsinə seçildi. Bir müddət laboratoriyada səmərəli elmi fəaliyyət göstərdi. ADPU ilə bərabər həm də Bakı Qızlar Universitetinin Pedaqogika kafedrasında çalışır, pedaqogikanın nəzəriyyəsi və tarixindən mühazirələr oxuyurdu.

Bəhruz müəllimin akademik Hüseyn Əhmədovun yetirmələri arasında öz dəst-xətti, öz yeri vardı. Onun tədqiqatı Qori Müəllimlər Seminariyasının məzunlarından biri olan Mahmud bəy Mahmudbəyovla bağlı olduğundan Hüseyn müəllim Bəhruzu zarafatla "Mahmud əmi" - deyə çağırırdı. Elə mən özüm də ona "Mahmud əmi" deyirdim. Mahmud bəy Mahmudbəyov XX əsrin əvvəllərində fəaliyyət göstərən görkəmli maarifçilərimizdən biridir. Təhsil-tərbiyə ilə bağlı mükəmməl konsepsiyaya malikdir. Unikal dərsliklər müəllifidir. XIX əsrin sonu- XX əsrin əvvəllərində Azərbaycanda təhsil və pedaqoji fikir tarixinin inkişafında Mahmud bəy Mahmudbəyovun göstərdikləri fədakarlığı məhz Bəhruz müəllim fəlsəfə doktoru dissertasiyası səviyyəsində araşdırıb, onun təhsil-tərbiyənin məqsədi, məzmunu, prinsipləri, üsulları ilə bağlı nəzəri fikirlərini ümumiləşdirib, müasir dövr üçün əhəmiyyətini üzə çıxarıb, "Yeni əlifba", "Türk əlifbası və ilk qiraət" (1907), "İkinci il" (1908), "Türk dilinin təlimi üçün üçüncü ilə məxsus qiraət kitabı" (1909), "İmlamız" (1911), "Yeni türk əlifbası" (1922) dərsliklərinin məziyyətlərini təhlil edərək yenidən elmi dövriyyəyə daxil edib. Gələcək müəllimlər Mahmud bəy Mahmudbəyovun maarifçilik görüşləri ilə məhz Bəhruz müəllim yaradıcılığı əsasında tanış olurlar.

Bəhruz müəllim elmi-pedaqoji fəaliyyəti dövründə ciddi elmi problemlərdən yazdı. "Hacı Rəhim Əfəndi" (1993), "Ali məktəbdə təlimin xüsusiyyətləri və onun səmərəli təşkilinin bəzi məsələləri" (1996), "Mahmud bəy Mahmudbəyov və ibtidai təhsilin inkişafı" (2007), "Qaraman kəndi haqqında tarixi oçerklər" (2010) kitablarını, 30-a yaxın elmi-pedaqoji məqalə yazdı, 10 tədris proqramı tərtib etdi. Elmi konfranslarda pedaqogikanın tarixi və nəzəriyyəsi ilə bağlı maraqlı və yadda qalan məruzələrlə çıxış etdi. İbtidai sinif müəllimliyi hazırlığı üçün Çərçivə kurikulumunun hazırlanmasında iştirak etdi. Azərbaycan televiziyasında professor Zahid Xəlilovun apardığı "Sərbəst düşüncə studiyası" verlişindəki müzakirələrdə maraqlı mülahizələri ilə yadda qaldı. Mənim təşəbbüsümlə Təhsil Nazirliyinin attestasiya və akkreditasiya komissiyasına üzv seçildi. Pedaqoji təmayüllü ali məktəblərin akkreditasiyasında iştirak etdi. Tələbkarlığı xeyirxahlığa birləşdirməyi bacardı. Özünə yeni-yeni dostlar qazandı. Harada oldusa, nə işlə məşğul oldusa, orada müəyyən iz qoydu.

Keçən ilin aprel ayı idi. Çox narahat idi. Özünü yaxşı hiss etmədiyini desə də, ciddi xəstəlik keçirdiyini xəyalına belə gətirməzdi. Övladları ilə bağlı böyük arzuları vardı. Hər bir ata təbii ki, öz balasını sevir, o, balalarını - Fəridi, Əzizi, Leylanı yalnız çox istəmirdi, onların üstündə əsirdi. Uşaqlıqda o qədər çətinliklər görmüşdü ki, balalarının rahat və qayğısız yaşaması üçün özünü oda-közə vururdu. Arzularının zirvəsinə yetməmiş, ömrünün sahilinə çatdı. Amansız xəstəlik onu aramızdan tez apardı. Bizim dost itirən vaxtımız olmasa da, dəyərli bir alimi, sədaqətli dostumuzu, peşəkar bir müəllimi itirdik. Bəhruz müəllimin ölüm xəbərini eşidəndə mənə elə gəldi ki, pedaqogika kafedrası bir az da kiçildi, cərgələrimiz seyrəldi... Sizi tez itirdik, Bəhruz müəllim!..

Allah rəhmət eləsin!

**Fərrux Rüstəmov,**
**İbtidai təhsil fakültəsinin dekanı, pedaqogika üzrə elmlər doktoru, Əməkdar elm xadimi, professor**



# ADPU-nun Cəlilabad filialında 8 Mart-Beynəlxalq Qadınlar Günü münasibətilə tədbir keçirilib

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad filialında 8 Mart-Beynəlxalq Qadınlar Günü münasibətilə tədbir keçirilib. Tədbirdə ADPU-nun Cəlilabad filialının direktor müavini E.Məmmədov, filialın əməkdaşları və tələbələri iştirak ediblər. Tədbiri giriş sözü ilə E.Məmmədov açıb. E.Məmmədov çıxışında ilk olaraq Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, Yeni Azərbaycan Partiyasının Sədr müavini, millət vəkili, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyevanın şəxsində bütün Azərbaycan qadınlarını, o cümlədən ADPU-nun Cəlilabad filialının xanımlarını və tələbə xanımlarını 8 Mart-Beynəlxalq Qadınlar Günü münasibətilə təbrik edib, onlara uğurlar arzulayıb. O, qeyd edib ki, Azərbaycan qadını dövlət müstəqilliyimizin bərpasından sonra milli dövlət quruculuğu prosesinin fəal iştirakçısına çevrilib, ölkəmizin sosial-iqtisadi, intellektual-mədəni potensialının artırılmasına dəyərli töhfələr verib. Azərbaycan qadını elm və təhsil, səhiyyə və mədəniyyət, eləcə də digər sahələrdə qazandığı uğurlarla öz nüfuzunu ilbəil artırmağa müvəffəq olub. Qadınlarımızın vətəndaş cəmiyyəti quruculuğunda qazandığı nailiyyətlər hər birimizdə məmnunluq hissi doğurur. Ölkəmizdəki sabitlik və demokratik mühit gələcəkdə də onlara öz bilik və istedadlarını, bacarıqlarını, yaradıcılıq imkanlarını tam gerçəkləşdirə bilmələri üçün bütün lazımi şəraiti təmin edir.



E.Məmmədov çıxışının sonunda bir daha qadınları təbrik edib, onlara cansağlığı, uzun ömür və səadət, xoşbəxtlik arzulayıb.

ADPU-nun Cəlilabad filialının Tələbə Gənclər Təşkilatının (TGT) sədri Rəvanə Cəbrayılova çıxış edərək qadınları təbrik edib, onlara ən xoş, ən səmimi arzularını bildirib.

Tədbirdə çıxış edən digər tələbə-gənclər də öz çıxışları və ifa etdikləri şeirlərlə xanımlara xoş ovqat bəxş ediblər.

## ADPU-nun Ağcabədi filialında 8 Mart-Beynəlxalq Qadınlar Günü münasibətilə bayram tədbiri keçirilib

7 mart 2016-cı il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi filialında 8 Mart-Beynəlxalq Qadınlar Günü münasibətilə bayram tədbiri keçirilib.

ADPU-nun Ağcabədi filialının direktoru, dosent Mətanət Fərzəliyeva tədbiri giriş sözü ilə açaraq 8 Mart-Beynəlxalq Qadınlar Gününün tarixindən danışıb, qadının müasir cəmiyyətdəki rolunu yüksək qiymətləndirib. Kollektivin qadın üzvlərini səmimi-qəlbdən təbrik edən direktor M. Fərzəliyeva səmərəli elmi-pedaqoji fəaliyyətdə onlara uğurlar, şəxsi həyatda cansağlığı və mənalı ömür arzulayıb.

Tədbirdə çıxış edən ADPU-nun Ağcabədi filialının dosentləri - S.Zeynalov, T.Kərimli, B.Ələsgərov, S.Süleymanov, Ə.Umudov, baş müəllim F.Mikayılova kollektivin qadın üzvlərini ürəkdən təbrik edərək onlara xoşbəxtlik, səadət arzulayıblar.

Tədbirin sonunda filialın qadın əməkdaşlarına müxtəlif hədiyyələr təqdim edilib.



## ADPU-nun Zaqatala filialının kollektivi Novruz bayramı münasibətilə keçirilən ümumrayon tədbirində iştirak edib

Xalqımızın qədim və əziz milli bayramı olan Novruz bayramı respublikamızın hər yerində olduğu kimi, Zaqatala rayonunda da yüksək səviyyədə keçirilib. Qeyd edək ki, mart ayının 21-də Zaqatala şəhərində Novruz bayramına həsr edilmiş ümumrayon tədbiri keçirilib. Tədbirdə Zaqatala Rayon İcra Hakimiyyətinin rəhbərliyi, ADPU-nun Zaqatala filialının professor-müəllim heyəti və tələb-gəncləri, tanınmış incəsənət ustaları, rayon ictimaiyyətinin nümayəndələri iştirak ediblər. Bayram şənliyi hamıda xoş əhval-ruhiyyə yaradıb.




## ADPU -nun Qazax filialında Novruz bayramı şənliyi keçirilib

Mart ayının 15-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Qazax filialında ən qədim milli bayramlardan olan Novruz bayramının gəlişi ilə əlaqədar Novruz şənliyi keçirilib. Qeyd edək ki, ADPU-nun Qazax filialının həyətinda bahar fəslinin gəlişini əks etdirən Novruz bayramının rəmzi olan lövhələr vurulmuşdu. Tələbələrin bir qismi isə Novruz bayramının rəmzi olan lövhə təşkil etmişdilər. Tədbiri tələbələr açaraq professor-müəllim heyətini Novruz bayramı münasibətilə təbrik ediblər.




ADPU-nun Qazax filialının direktoru, dosent Afaq Qasımova çıxış edərək universitetin rektoru ,AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov başda olmaqla, universitetin professor-müəllim heyətini, eləcə də filialın kollektivini Novruz bayramı münasibətilə təbrik edib, ən xoş, ən səmimi arzularını bildirib. Sonra meydana Novruz bayramının personajları olan Kosa və Keçəl gəlib. Tələbəl-gənclərin təşkil etdikləri maraqlı səhnəciklər, onların maraqlı söhbətləri, məzhəkələri hər kəsdə xoş ovqat yaradıb. Milli paltar geyinmiş tələbə-gənclər qədim adət-ənənələri- nehrə çalxalamaq, badambura, şəkərbura, fəsəli bişirmək qabiliyyətlərini nümayiş etdiriblər. Sonra Novruz tonqalı alovlandırılıb. Bayram şənliyi qara zurna sədaları altında tonqal ətrafında rəqs etməklə başa çatıb.

## ADPU-nun Quba filialında Novruz bayramı münasibətilə "Novruz-2016" adlı müxtəlif tədbirlər keçirilib

Həmişə olduğu kimi, bu il də milli bayramımız olan Novruz bayramı şənlikləri Quba rayonunda yüksək səviyyədə keçirilib və daha yaddaqalan olub. Əvvəlcə onu qeyd edək ki, 16 mart 2016-cı il tarixində Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialında Novruz bayramı münasibətilə "Öz şöləni kəşf et" devizi ilə tədbir və yaradıcılıq müsabiqəsi keçirilib. Müsabiqədə "İbtidai sinif müəllimliyi" ixtisasının II kurs tələbəsi Emin Tahayev çəkdiyi "Novruz-Quba" şəkli ilə qalib gəlib, "Azərbaycan dili və ədəbiyyatı müəllimliyi" ixtisasının III kurs tələbəsi Turanə İsmayılzadə isə "Bahar gəlir" nəğməsi ilə tədbir iştirakçılarının diqqətini cəlb edib. Müsabiqədə həmçinin tələbələrimiz saz, nağara, gitara kimi müxtəlif çalğı alətlərində də öz qabiliyyətlərini nümayiş etdiriblər. Qeyd edək ki, qaliblər hədiyyə və diplomlarla mükafatlandırılıblar. Daha sonra müsabiqə tədbir proqramı ilə davam etdirilib. Tədbirdə tələbə-gənclər xüsusi fəallıq nümayiş etdirərək gənclərimizin adət-ənənələrimizə münasibətini bir daha vurğulayıblar.

Bunlarla yanaşı, Novruz bayramı münasibətilə ADPU-nun Quba filialının müəllim kollektivi tələbələr tərəfindən xüsusi təbrik edilib, bu məqsədlə banerlər hazırlanıb, kafedralara gül dəstələri verilib. Bayram təbrikləri çay süfrəsi arxasında davam etdirilib.



17 mart 2016-cı il tarixində isə ADPU-nun Quba filialının rəhbərliyinin, tələbə və müəllim kollektivinin xüsusi təşkilatçılığı nəticəsində Quba Meydanında keçirilən tədbirdən, bayram süfrəsindən, bayram personajları olan Kosa və Keçəlin təqdimatından, qədim adət-ənənələrimizi əks etdirən səhnəciklərdən, tələbələrin rəqs və musiqi nömrələrindən Quba Rayon İcra Hakimiyyətinin rəhbərliyi, eləcə də rayon sakinləri razı qalıblar.

Novruz bayramı tədbirində tələbələrimiz öz şeir, musiqi və rəqs nömrələri ilə tədbir iştirakçılarının simasında bütün Azərbaycan xalqının bu əziz bayramını təbrik ediblər.

## ADPU-nun Şamaxı filialında Novruz bayramı münasibətilə tədbir keçirilib

18 mart 2016-cı il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı filialında Novruz bayramı münasibəti ilə tədbir keçirilib. ADPU-nun Şamaxı filialının direktoru, filologiya üzrə fəlsəfə doktoru Tünzalə Yusifova tədbirdə giriş sözü ilə çıxış edərək bildirib ki, Novruz bayramı xalqımızın əsrlərdən bəri qoruyub saxladığı və həmişə əziz tutduğu bayramlardan biridir. Onun tarixi də Azərbaycan xalqının tarixi kimi keşməkeşli, enişli-yoxuşlu olmuşdur. Bu ulu bayramın müstəqil respublikamızda dövlət səviyyəsində qeyd edilməsi öz milli köklərimizə, tarixi keçmişimizə, adət-ənənələrimizə dərin ehtiram bəslədiyimizi və sarsılmaz tellərlə bağlı olduğumuzu nümayiş etdirir. Zəngin mənəvi dəyərlərimizə söykənərək insanlar arasında qarşılıqlı hörmət, səmimiyyət və mehribanlıq münasibətlərini bərqərar edən Novruz bayramı xalqda gələcəyə nikbinliklə, ümidlə baxmaq hisləri doğurur.




Sevindirici haldır ki, xalqımız Novruz əxlaqi dəyərlərini bu gün də yaşadıb davam etdirməkdədir. Xalqımız öz dövlət müstəqilliyini yenidən bərpa etdikdən sonra və ulu öndər Heydər Əliyevin yenidən respublikamızda hakimiyyətə gəldikdən sonra Novruz bayramı ümumxalq bayramı elan edilmiş, onun üzərindən bütün qadağalar götürülmüşdür. İndi Novruz hər yerdə böyük bayram kimi kütləvi şənliklərlə qeyd edilir.

Həmin vaxtlar ümumxalq şənliklərində iştirak edən dahi şəxsiyyət Heydər Əliyev deyirdi: "Novruz bayramı xalqın milli birlik, sarsılmaz dostluq və qardaşlıq bayramıdır. Ürəklərdən kinküdurəti silib, yerində sevgi, məhəbbət və sədaqət kimi saf duyğular cücərdən, bölümləri bütövlüklə, kədəri sevinclə əvəz edən, cəmiyyətdə xoş münasibətlərin meydanını genişləndirən bir bayramdır. Novruz uzaq minilliklərin o tayından çağdaş dövrümüzə qədər ağır təzyiqlərə sinə gərə-gərə, keçilməz maneələri yara-yara müstəqillik qazanıb".

Direktor T.Yusifova tədbir iştirakçılarını bu əziz gün münasibəti ilə təbrikində Novruzda təbiətin oyandığını, saf duyğuların, ülvi niyyətlərin, xoş arzuların çin olduğunu bildirib, xalqımıza müharibəyə birdəfəlik son qoyulması, torpaqlarımızın azad edilməsi, erməni təcavüzü nəticəsində didərgin düşmüş soydaşlarımızın öz doğma yurdlarına qayıtması kimi müqəddəs diləklərimizin həyata keçməsini və gələn Novruz bayramını daha şad və xoş əhval-ruhiyyə ilə qarşılamağı arzulayıb.

Sonra tədbir bayram tonqalının yandırılması ilə davam edib. Novruzun əsas personajları olan Keçəl, Kosa və Bahar qızının tələbələrin çağrışı ilə tədbirə qatılmaları bayram şənliyinə xüsusi ovqat verib. Tələbələrin Novruz hazırlıqları bayrama necə həvəsli olduqlarını göstərirdi.

Keçəl və Kosanın dialoqu, oyunlar, Bahar qızının mahnısı, tələbələrin ifa etdiyi səhnələr, rəqslər, musiqi nömrələri, tonqal ətrafında "Yallı" oynamaları tədbir iştirakçılarında yüksək əhval-ruhiyyə yaradıb. Tədbirdə yumurta döyüşü, qruplararası xonça və səməni yarışı keçirilib. Yarışın qalibləri qiymətli hədiyyələrlə təltif olunublar.

Şamaxı rayonunun tanınmış aşıqlar qrupu filialın əməkdaşlarını və tələbələrini rəngarəng musiqilərlə təbrik ediblər.

Tədbirin sonunda filialın tələbələri Şamaxı şəhər 1saylı İxtisaslaşmış Ruhi Əsəb Xəstəlikləri İnternat Evinin xəstələrini də unutmayıb, yığılan bütün bayram xonçaları ilə onları bayram münasibəti ilə təbrikə gediblər.

Qeyd edək ki, ADPU-nun Şamaxı filialının professor- müəllim və tələbə heyəti rayonda bayram nünasibəti ilə keçirilən tədbirlərdə də yaxından iştirak ediblər.

## ADPU-nun Quba filialında 31 Mart- Azərbaycanlıların Soyqırımı Günü ilə bağlı anım tədbiri keçirilib

30 Mart 2016-cı il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Quba filialında 31 Mart - Azərbaycanlıların Soyqırımı Günü ilə bağlı anım tədbiri keçirilib. Tədbir Quba Soyqırımı Memorial Xatirə Kompleksində gerçəkləşib. Filialın professor-müəllim heyətinin və tələbələrin iştirak etdiyi anım tədbirində soyqırımı qurbanlarının xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

Tədbirdə çıxış edənlər 1918-ci ilin mart-aprel aylarında Bakı şəhərində və Bakı quberniyasının müxtəlif bölgələrində, eləcə də Şamaxı, Quba, Xaçmaz, Lənkəran, Hacıqabul, Salyan, Zəngəzur, Qarabağ, Naxçıvan və digər ərazilərdə Bakı Soveti və daşnak erməni silahlı dəstələrinin azərbaycanlılara qarşı törətdikləri cinayətlərin yaddaşlarda dərin izlər qoyduğunu bildiriblər. Sonra Quba Soyqırımı Memorial Xatirə Kompleksi önünə gül dəstələri düzülüb.





Onu da qeyd edək ki, mart ayının 30-da ADPU-nun Quba filialında 31 Mart-Azərbaycanlıların Soyqırımı Günü ilə bağlı ilk dərslər bu mövzuya həsr edilib, keçmişdən bu günə kimi Azərbaycan xalqının başına gətirilən müsibətləri əks etdirən videoçarx tələbə-gənclərə nümayiş olunub və digər maarifləndirici tədbirlər həyata keçirilib.

Həmçinin ADPU-nun Quba filialının kollektivi 31 Mart-Azərbaycanlıların Soyqırımı Günü ilə bağlı martın 31-də Quba rayonunda keçirilən ümumrayon yürüşündə də iştirak edərək Quba Soyqırımı Memorial Xatirə Kompleksini bir daha ziyarət edib və burada erməni vəhşiliyini sübut edən tarixi faktlarla daha dərindən tanış olublar.

## ADPU-nun Ağcabədi filialında 31 Mart - Azərbaycanlıların Soyqırımı Gününə həsr edilmiş anım mərasimi keçirilib

30 mart 2016-cı il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Ağcabədi filialında 31 Mart -Azərbaycanlıların Soyqırımı Gününə həsr edilmiş anım mərasimi keçirilib. Anım mərasimində əvvəlcə Vətən torpaqları uğrunda həlak olmuş soydaşlarımızın xatirəsi bir dəqiqəlik sükutla yad edildi. ADPU-nun Ağcabədi filialının direktoru, dosent Mətanət Fərzəliyeva tədbiri giriş sözü ilə açaraq xalqımızın tarix boyu başına gətirilən müsibətlərdən danışdı və bunların fonunda 31Mart-Azərbaycanlıların Soyqırımı Gününün heç vaxt unudulmayacağını bildirdi.



Sonra 31 Mart -Azərbaycanlıların Soyqırımı Günü ilə bağlı məruzə etmək üçün söz ADPU-nun Ağcabədi filialının dosenti Məhəmməd Hüseynova verildi. Dosent M.Hüseynova bildirdi ki, 1918-ci ilin 31 Mart soyqırımı xalqımızın ən ağrılı-acılı bir tale yazısıdır. O, qeyd etdi ki, 31 Mart soyqırımı ümumilikdə xalqımıza qarşı uzun illər öncədən hazırlamış planın yalnız bir hissəsidir. Azərbaycanda azadlıq hərəkatının alovlanması düşmən qüvvələrinin narahatçılığına səbəb olduğu üçün qırğın aktının törədilməsi ermənilər üçün vacib amilə çevrildi. Nəhayət, rus-erməni şovinizminin birgə planına əsasən hər yerdə dinc əhali qətlə yetirildi, müsəlmanlar məhv edildi.

31 Mart soyqırımında on iki min nəfərdən çox azərbaycanlı əks-inqilabçı adı ilə qətlə yetirildi. Uzun illər xalqımıza qarşı törədilmiş bu qatı cinayət öz həqiqi qiymətini ala bilmədiyi və əsl mahiyyəti üzə çıxarılmadığı üçün xaqlımız düşmən erməni xalqına qarşı həmişə dostluq və qardaşlıq mövqeyində olmuş, dinc yanaşı yaşamışdır. Sovetlər dönəmində tamamilə unutdurulan 31 Mart soyqırımı öz həqiqi siyasi-hüquqi qiymətini ulu öndərimiz Heydər Əliyevin 1998-ci il 26 mart tarixli Fərmani ilə almış oldu.

Dosent M.Hüseynov çıxışınının sonunda xalqımıza qarşı bir-birinin ardınca törədilmiş soyqırımlarının dünyada tanıdılması istiqamətində Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin və Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, millət vəkili Mehriban xanım Əliyevanın böyük xidmətləri olduğunu bildirdi.

Məruzə ətrafında çıxış üçün söz filialın baş müəllimi Araz Əliyevə verildi. A.Əliyev bildirdi ki, 31 Mart soyqırımı iki yüz ildən artıq xalqımıza qarşı aparılmış soyqırımı siyasətinin tərkib hissəsidir. Qafqazda "Böyük Ermənistan" yaratmaq, regionda liderlik etmək məqsədi güdən ermənilər xalqımıza qarşı amansızlıq göstərmiş, 31 Mart soyqırımını həyata keçirərkən qocalara, qadınlara işgəncələr vermiş, misli görünməmiş cinayətlər törətmişlər. O, müstəqillik dövründə bu istiqamətdə aparılmış tədqiqatlardan da danışdı. A.Əliyev bildirdi ki, yağı düşmənimiz olan ermənilər hazırda torpaqlarımızın iyirmi faizinə nəzarət edirlər. Bu gün biz təkcə yaxın keçmişimizdə itirilən torpaqlarımızın azad edilməsi uğrunda mübarizə aparmaqla kifayətlənməməli, eləcə də Qərbi Azərbaycandakı torpaqlarımızında geri qaytarılması uğrunda çalışmalıyıq.

Növbəti çıxış üçün söz filialın dosent əvəzi, pedaqogika üzrə fəlsəfə doktoru T.Kərimliyə verildi. O, 31 Mart soyqırımına münasibət bildirərkən qeyd etdi ki, ermənilər daim xalqımıza qarşı düşmən mövqeyində dayanmış, ən adi insanından tutmuş aliminə, şairinə qədər hər birisi millətçilik ideyalarını təbliğ edərək erməni-müsəlman münaqişəsinə zəmin yaratmışdır. Bildirdi ki, xüsusən gənc nəsil tariximizi yaxşı bilməli, xalqımızın yaşadığı tarixi faciələri unutmamalı və amansız düşmənə qarşı mübariz olmalıdır.

Növbəti çıxış üçün söz filialın baş müəllimi, fəlsəfə üzrə fəlsəfə doktoru Mahir Səlimova verildi. O, da öz növbəsində xalqımıza qarşı törədilmiş bu qatı cinayətin tarixi köklərindən danışdı, 12500 nəfərdən çox erməni silahlısının qatıldığı bu qırğında baş verən dəhşətlərin saya gəlmədiyini bildirdi.



31 Mart soyqırımının hüquqi dəyər almasında ümummilli liderimiz Heydər Əliyevin böyük tarixi xidmətlərindən danışan M.Səlimov onu da bildirdi ki, Ulu Öndərimiz hər dəfə dünya ölkələrinin rəhbərləri ilə görüşündə təxminən 584 dəfə soyqırımı aktını onların diqqətinə çatdırmışdır.

Flialının dosenti Baxış Ələsgərov tədbirdə çıxış edərək bildirdi ki, 1918-ci ilin 31 Mart soyqırımı faktı öz qaynağını hələ 1828-ci ilin Türkmənçay müqaviləsindən alır. Rus şovinizminin apardığı çirkin siyasət nəticəsində planlı şəkildə ermənlərin Azərbaycan torpaqlarında məskunlaşdırılması gələcəkdə törənəcək bu tarixi faciəyə hazırlığın ilk pilləsi kimi qiymətləndirilməlidir. Sonralar regionda ermənilərə arxa-dayaq çıxan ruslar hər vasitə ilə onları dəstəkləməyə çalışmış, ermənilər bundan istifadə edərək xalqımıza əsassız ərazi iddialarına qalxmış, minlərlə dinc insanın ölümünə bais olmuş və iyirmi faiz torpaqlarımızı işğal etmişlər. Xalqımızın başına gətirilən bu qədər müsibətlərin, dəhşətlərin önündə dünya birliyi hələ də susur.

Tədbirin sonunda ADPU-nun Ağcabədi filialının direktoru, dosent M.Fərzəliyeva bildirdi ki, xalqımız heç vaxt 31 Mart soyqırımını unutmayacaq və düşmənə qarşı layiqli mübarizə aparacaqdır.

## ADPU-nun Şamaxı filialında 31 Mart-Azərbaycanlıların Soyqırımı Gününə həsr edilmiş dəyirmi masa keçirilib

Mart ayının 30-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şamaxı filialında 31 Mart-Azərbaycanlıların Soyqırımı Gününə həsr edilmiş dəyirmi masa keçirilib. Tədbirdə ilk olaraq 31 mart soyqırımını əks etdirən film nümayiş etdirilib və soyqırımı zamanı həlak olmuş soydaşlarımızın xatirəsi bir dəqiqəlik sükutla yad edilib.



ADPU-nun Şamaxı filialının direktoru, filologiya üzrə fəlsəfə doktoru Tünzalə Yusifova tədbiri giriş sözü ilə açaraq bildirib ki, "Böyük Ermənistan" yaratmaq xülyasından ruhlanan erməni qəsbkarları 1905-1907-ci illərdə azərbaycanlılara qarşı açıq şəkildə genişmiqyaslı qanlı aksiyalar həyata keçiriblər. Ermənilərin Bakı şəhərindən başlanan vəhşilikləri Azərbaycanı və indiki Ermənistan ərazisindəki Azərbaycan kəndlərini əhatə edib. Yüzlərlə yaşayış məntəqəsi dağıdılıb yerlə-yeksan edilib, minlərlə azərbaycanlı vəhşicəsinə qətlə yetirilib. Bu qanlı hadisələrin təşkilatçıları məsələnin mahiyyətinin açılmasına, ona düzgün siyasi-hüquqi qiymətin verilməsinə maneçilik törədərək azərbaycanlıların mənfi obrazını yaradaraq, özlərinin avantürist torpaq iddialarını pərdələyiblər. Birinci Dünya müharibəsi, Rusiyada baş vermiş 1917-ci ilin fevral və oktyabr çevrilişlərindən məharətlə istifadə edən ermənilər öz iddialarını bolşevik bayrağı altında reallaşdırmağa nail olublar. 1918-ci ilin mart ayından etibarən əks-inqilabçı ünsürlərə qarşı mübarizə şüarı altında Bakı quberniyasını azərbaycanlılardan təmizləmək məqsədi güdən mənfur plan həyata keçirilməyə başlanılıb. Erməni daşnakları özlərinin lideri və Türk dünyasının qatı düşməni olan daşnak Stepan Şaumyanın rəhbərliyi ilə 1918-ci ilin martında təkcə Bakı şəhərində və şəhərətrafı kəndlərdə 30 min azərbaycanlını qətlə yetiriblər. Bu, əsl soyqırımı idi.

Dəyirmi masada Humanitar və xüsusi fənlər kafedrasının müdiri, tarix üzrə fəlsəfə doktoru, dosent Mayıl Alcanov, Dil-ədəbiyyat və onların tədrisi metodikası kafedrasının müəllimi Bəhrəm Bağıyev də ermənilərin törətdikləri dəhşətlərdən danışıblar.

Tədbirdə tələbə Nərmin Maqsudova çıxış edərək soyqırıma, onu törədənlərin riyakarlıqlarına öz mənfi münasibətini bildirib.

Tədbirin sonunda Elnarə Məmmədova "Gün otuz biri" şeirini söyləyib.

Qeyd edək ki, filialın professor-müəllim heyəti və tələbə-gəncləri rayon ictimaiyyəti ilə birlikdə rayonda yerləşən 1918-ci il 31 Mart Şamaxı Soyqırımı Abidəsini ziyarət edərək gül dəstələri düzüblər, həmçinin Şamaxı Şəhər İncəsənət Təhsili Mərkəzində təşkil olunmuş tədbirdə iştirak ediblər.

## ADPU-nun Zaqatala filialında 31 Mart - Azərbaycanlıların Soyqırımı Gününə həsr edilmiş elmi-praktik konfrans keçirilib

Mart ayının 30-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Zaqatala filialında 31 Mart-Azərbaycanlıların Soyqırımı Gününə həsr edilmiş elmi-praktik konfrans keçirilib. Elmi-praktik konfrans Azərbaycanın Dövlət Himninin səslənməsi və soyqırımı qurbanlarının xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlayıb.



Elmi-praktik konfransı giriş sözü ilə ADPU-nun Zaqatala filialının direktoru, professor Orucəli Rzayev açıb. Professor O.Rzayev çıxışında qeyd edib ki, azərbaycanlılara qarşı düşünülmüş şəkildə iki əsrdən çox davam edən və geniş miqyasda həyata keçirilən soyqırımı nəticəsində yüzlərlə yaşayış məntəqəsi yerlə-yeksan edilib, minlərlə azərbaycanlı qəddarlıqla qətlə yetirilib. Ermənilərin Azərbaycana qarşı uzun illər apardıqları ardıcıl etnik təmizləmə siyasəti, soyqırımı və hərbi təcavüz nəticəsində minlərlə insan ev-eşiyindən didərgin düşüb.

Azərbaycanın XIX-XX əsrlərdə baş verən bütün faciələri torpaqlarının zəbti ilə müşayiət olunaraq ermənilərin azərbaycanlılara qarşı düşünülmüş, planlı surətdə həyata keçirdikləri soyqırımı siyasətinin ayrı-ayrı mərhələlərini təşkil etmişdir. 1813-1828-ci illərdə Rusiya ilə İran arasında gedən iki müharibənin sonunda imzalanmış Gülüstan və Türkmənçay müqavilələri Azərbaycan xalqının tarixində faciəli rol oynamış, Azərbaycanın parçalanmasına gətirib çıxarmışdır. 1918-ci ilin mart-aprel aylarında Bakı, Şamaxı, Quba, Muğan və Lənkəranda ermənilər otuz mindən çox azərbaycanlını qətlə yetirmiş, on minlərlə insanı öz torpaqlarından qovmuşdur. 31 mart soyqırımı tarixi bir faciədir.

Elmi-praktik konfransda Humanitar fənnlər kafedrasının müdiri, tarix üzrə fəlsəfə doktoru , dosent Qüdrət Qırtımov çıxış edərək 31 mart soyqırımını xalqımıza və bəşəriyyətə qarşı yönəldilmiş ağır bir cinayət kimi səciyyələndirib.

Konfransın sonunda tələbə-gənclərin iştirakı ilə "31 mart soyqırımı insanlığa qarşı amansız cinayətdir" adlı ədəbi-bədii kompozisiya nümayiş etdirilib, 31 mart soyqırımına həsr olunmuş filmə baxış keçirilib.

# ADPU-nun Cəlilabad filialında 31 Mart - Azərbaycanlıların Soyqırımı Günü ilə bağlı anım tədbiri keçirilib

Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Cəlilabad filialında 31 mart 2016-cı il tarixdə 31 Mart- Azərbaycanlıların Soyqırımı Günü ilə bağlı anım tədbiri keçirildi. Tədbirdə müəllim və tələbə heyəti iştirak edirdi.Tədbir soyqırımı qurbanlarının xatirəsinin bir dəqiqəlik sükutla yad edilməsi ilə başlandı.

ADPU-nun Cəlilabad filialının direktor müavini Eyvaz Məmmədov tədbiri giriş sözü ilə açaraq erməni daşnaklarının Azərbaycan xalqına qarşı törətdiyi amansız qətliamın təfərrüatlarından danışdı. O, qeyd etdi ki, ulu öndər Heydər Əliyevin 26 mart 1998-ci il tarixli Fərmanı ilə 1998-ci ildən 31 mart ölkəmizdə dövlət səviyyəsində Azərbaycanlıların Soyqırımı Günü kimi qeyd edilir. Bu soyqırımı həm Azərbaycan xalqının, həm də dövlətçiliyinin tarixində baş vermiş faciəli hadisələrə milli yaddaşın təzahürüdür. Azərbaycanlıların kütləvi surətdə qırğını, repressiyalara məruz qalması, doğma yurdlarından sürgün edilməsi və didərgin salınması XX əsr tarixinin ən faciəli və dəhşətli səhifələrindəndir . Biz bir xalq olaraq bu günü unutmamalı və düşmənlərə qarşı bir yumruğ kimi birləşməliyik. Gənclər bu tarixi yaxşı öyrənməli və gələcək nəsillərə ötürməlidirlər.



Sonra söz filialın baş müəllimi Şöhrət Namazovaya verildi. Baş müəllimi Ş.Namazova da düşmənlərimizin xalqımıza qarşı törədiyi qırğınlardan danışdı, qan yaddaşımıza çevrilmiş bu kimi hadisələrin gənclərimiz, xüsusilə sabahın müəllimləri olan tələbə-gənclər tərəfindən dərindən araşdırılaraq öyrənilməsinin zəruriliyini vurğuladı.

Daha sonra tarix üzrə elmlər doktoru Mürvət Abbasov çıxış etdi. O, soyqırımını tarixi baxımdan dəyərləndirərək bildirdi ki, erməni millətçilərinin xalqımıza qarşı həyat keçirdiyi təcavüz, zorakılıq, soyqırımı böyük bir tarixə malikdir. Bu istiqamətdə ən dəhşətli hadisələr 1918-ci ildə baş verib. Həmin fəlakətlərin təşkilatçısı nankor ermənilərin qəddar lideri Stepan Şaumyan olmuşdur. Hələ 1917-ci ildə RSFSR Xalq Komissarları Soveti tərəfindən Qafqaz İşləri üzrə Fövqəladə Komissar təyin edilmiş bu amansız erməni şovinisti təyinatının ilk günlərindən mürtəce ideyalarını həyata keçirmək - azərbaycanlılara qarşı fəlakətlər törətmək üçün hər an fürsət axtarmışdır. Onun əlinə belə bir fürsət 1918-ci ilin martında düşmüşdür. 1918-ci ilin mart-aprel aylarında ermənilər Bakı, Şamaxı, Quba, Muğan və Lənkəranda 50 mindən çox azərbaycanlını qətlə yetirmiş, 10 minlərlə insanı öz doğma yurd-yuvalarından didərgin salmışlar. Təkcə Bakıda 30 minə yaxın azərbaycanlı xüsusi qəddarlıqla öldürülmüşdür. Gənc nəsil bu acı tarixi unutmamalı, milli maraqlarımızı və dövlətçiliyimizi prinsipial şəkildə qorumalıdır.

Tədbirdə həmçinin Cəlilabad Rayon İcra Hakimiyyətinin, Gənclər və İdman İdarəsinin təşəbbüsü ilə 20 nəfər tələbə ilə Quba Soyqırımı Memorial Xatirə Kompleksini ziyarət etmiş filialın TGT sədri Rəvanə Cəbrayılova və digər tələbə-gənclər ziyarətlə bağlı təəssüratlarını bölüşdülər və əldə etdikləri materialları nümayiş etdirdilər.

# Kitabxanamız zənginləşir

1. İlham Əliyev. “İnkişaf-məqsədimizdir”. İyirmi beşinci kitab. iyun 2007-avqust 2007. B., “Azərnəşr”, 2015, 408 səh.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin oxuculara təqdim olunan “İnkişaf-məqsədimizdir” çoxcildliyinin bu cildində QUAM ölkələri dövlət başçıları-nın ikinci zirvə görüşündə nitqi,regional əməkdaşlığın daha da genişləndirilməsi-nə,enerji təhlükəsizliyi, nəqliyyat sahəsində əməkdaşlıq, regionların sosial-iqtisadi inkişafına, eyni zamanda iqtisadi-siyasi həyatın digər sahələrinə dair çıxışları,nitq və tövsiyələri və digər sənədlər toplusu yer almışdır.

2. İlham Əliyev. “İnkişaf-məqsədimizdir”. İyirmi altıncı kitab. avqust 2007-oktyabr 2007. B., “Azərnəşr”, 2015, 400 səh.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin oxuculara təqdim olunan “İnkişaf-məqsədimizdir” çoxcildliyinin bu cildində Vilnüsdə “Energetika Sahəsində Təhlükəsizliyə Dair” adlı konfransda və Azərbaycan-Xorvatiya biznes-forumunda çıxışı, GUAM-ın üzv ölkələrinin dövlət başçılarının bu təşkilatın yaranmasının 10 illiyinə həsr olunmuş görüşdə nitqi verilmişdir.

3. Ənvər Seyidov. “Heydər Əliyev və Azərbaycan Respublikasının Konstitusiyası”. Dərs vəsaiti. Azərbaycan Respublikası Təhsil Nazirliyi tərəfindən ali məktəb tələbələri üçün nəzərdə tutulmuşdur. Bakı, ADPU-nun nəşriyyatı, 2014, 405 səh.

4. Ramiz Mehdiyev. “Dünya nizamından nizamsızlığa doğru”. Avropa strukturlarının deqradasiyasının mənbələri haqqında və ya Azərbaycana münasibətdə ikili standartlar siyasəti. Bakı, “Şərq-Qərb Nəşriyyat Evi”, 2015,200 səh.

Azərbaycan Respublikası Prezidenti Administrasiyasının rəhbəri, Azərbaycan Milli Elmlər Akademiyasının həqiqi üzvü Ramiz Mehdiyevin bu kitabında müasir dünyada siyasi böhranın səbəbləri hərtərəfli təhlil edilir.

5. N.A.Verdizadə, H.İ.İbrahimov. “Oksidimetriya”. Dərs vəsaiti. Bakı, 2008, 86 səh.

Həcmi analizin oksidmetriya sahəsini əhatə edən dərs vəsaitində oksidləşmə-reduksiya proseslərinin mahiyyəti və nəzəri əsasları ətraflı araşdırılmışdır.

6. Kazımov Zahir Fərhad oğlu. “Riyaziyyatın ibtidai kursunun nəzəri əsasları” (məsələ və misallar) . Bakı, ADPU-nun nəşriyyatı, 2013, 307 səh.

Təqdim olunan bu vəsait ali pedaqoji məktəblərin ibtidai təhsil fakültəsinin tələbələri üçün nəzərdə tutulmuşdur.

7. Marina Kaparini, Otvin Marenin. “Mərkəzi və Şərqi Avropada Polisin trans-formasiyası”. Proses və inkişaf. Bakı,2003, 360 səh.

8. “Təhlükəsizlik sektoruna parlament nəzarəti”: Qaydalar, mexanizmlər və görülən işlər. Cenevrə-Bakı, “Aypara” nəşriyyatı, 2004, 211 səh.

9. H.F.Quliyeva. “Zərərli həşəratlar: neyroendokrin tənzimin fizioloji və biokimyəvi aspektləri”. Azərbaycan Milli Elmlər Akademiyasının 70 illiyinə həsr olunur. Bakı, “Bayramoğlu”, 2015, 397 səh.

Monoqrafiyada həşəratların neyroendokrin sisteminin strukturu, metamozfoz hormonlarının kimyəvi təbiəti və həyat fəaliyyətinin ən mühüm proseslərinin tənzimində iştirakı barədə məlumat verilir.

10. Mais Əmrah, Məhsəti Mais qızı. “Şəkidə təhsil: tarix, inkişaf yolu”. Bakı, 2014, 522 səh.

Kitabda Nuxanın (Şəkinin) tarixinə qısa nəzər salınmış, ilk qəza məktəbinin açılması və inkişafı, bu məktəblərdə təhsil alan gənclər və onların sonrakı taleyi, Nuxanın (Şəkinin) əməkdar müəllimləri və Şəki təhsilinin yetirmələri haqqında biobiblioqrafik məlumatlar yer almışdır.

11. “Təhsilin aktual problemləri”. ( AR TPİ-da aparılmış pedaqoji tədqiqatların nəticələrinə həsr olunmuş konfransdakı məruzələrin tezisləri). Bakı, “Mütərcim”, 2007, 132 səh.

12. Musa Qasımlı. “ Azərbaycan Respublikasının xarici siyasəti” (1991-2003) II hissədə.I hissə. Bakı, “Mütərcim”, 2015, 648 səh.

Azərbaycan Respublikası Xarici İşlər Nazirliyinin qərarı ilə “Azərbaycan Respublikasının diplomatiya tarixi” seriyasından hazırlanan və iki hissədən ibarət olan bu kitab 1991-2003-cü illərin xarici siyasətini əhatə edir.

13. Musa Qasımlı. “Azərbaycan Respublikasının xarici siyasəti” (1991-2003) II hissədə. II hissə. Bakı, “Mütərcim”, 2015, 664 səh.

Azərbaycan Respublikası Xarici İşlər Nazirliyinin qərarı ilə “Azərbaycan Respublikasının diplomatiya tarixi” seriyasından hazırlanan və iki hissədən ibarət olan bu kitab 1991-2003-cü illərin xarici siyasətini əhatə edir.Müəllif Azərbaycan, Rusiya, Gürcüstan, Türkiyə, ABŞ, Böyük Britaniyanın və digər ölkələrin mötəbər mənbələri, Praqada ATƏT arxivinin, Vyanada BMT və AEBA kitabxanalarının materialları əsasında Azərbaycan diplomatiya tarixinin bu müddət ərzində keçdiyi yolu işıqlandırmışdır.

14. Məmmədova Leyla Nəbi qızı. “Azərbaycan təbiəti-Sözün qüdrətiylə”... “Azərbaycan təbiəti” elmi-metodik jurnalının (1975-2003) materialları əsasında. (Nəşrin 40 illiyinə həsr edilir). Bakı, “Elm və Təhsil” nəşriyyatı, 2015, 344 səh.

Kitabda hər zaman üçün həlli vacib olan aktual mövzu-təbiətin və ətraf mühitin insanlar tərəfindən düçar edildiyi problemləri işıqlandıran və təbiətin gözəlliyini vəsf edən əsərlər yer almışdır.

15. A. M. Məhərrəmov, M. M. Qurbanova. “Asimmetrik sintez (ali məktəblər üçün dərslik). “Bakı Universiteti Nəşriyyatı”, 2015, 208 səh.

Dərslik asimmetrik sintez istiqamətində mövcud olan mühüm məlumatların və ümumiləşdirmələrin əsasında tərtib olunmuşdur. Azərbaycan dilində bu səpkidə dərslik ilk dəfə yazılmışdır.

16. Soltan Atayev, Yeganə Cəlilova. “İbtidai siniflərdə naturadan rəsmin tədrisi metodikası”. Müəllimlər üçün metodik tövsiyə. Bakı, “Elm və Təhsil”, 2014, 104 səh.

17. Fərhad Məmmədov. “İlk peşə ixtisas təhsilində istehsalat təliminin təşkili və metodikası”. Bakı, “Zərdabi LTD” MMC, 2013, 224 səh.

18. Xəlil Rza Ulutürk. “Firəngiznamə” (təkmilləşdirilmiş nəşr). Bakı, “APOSTROFF”, 2016, 432 səh.

Bu kitab Xəlil Rza Ulutürkün Firəngiz xanıma yazdığı məktubları, gündəlikləri, şeirləri əsasında hazırlanmış ikinci nəşrdir. Birinci kitab 2013-cü ildə çap edilmişdir. Həmin kitabda Xəlil Rza və Firəngiz xanım məhəbbətinin salnaməsi verilmiş, xatirələr, məktublar və ərizələr özünə yer almışdır.

19. Qurban Əliyev, Sevinc Cəbrayılzadə. “Excel-2000” elektron cədvəli və praktik tapşırıqlar. Azərbaycan Respublikası Təhsil Nazirliyi EMŞ-nın “İnformatika və kompüter texnologiyası” bölməsinin 3 mart 2003-cü il tarixli iclasının qərarına əsasən çap edilir(pr №10). Bakı, 2003, 85 səh.

20. Əli Tudə. “Yanıqlı tütək”. IV cild. Bakı, “Azərbaycan” nəşriyyatı, 2015, 344 səh.

Azərbaycanın görkəmli şairi Əli Tudənin “Yanıqlı tütək” adlı bu kitabı sənətkarın çapı nəzərdə tutulmuş 20 cildliyinin 4-cü cildidir.

21. Qəbələ arxeoloji ekspedisiyası : hesabatlar, tapıntılar. Bakı, “CBS”, 2015, 283 səh.

22. Məhəmməd Balayev. “Azərbaycanda İslam dininin öyrənilməsi (1950-2000-ci illər)”. Bakı, “Şur”, 2005, 60 səh.

Kitabda İslam dininin ehkam, ayin, mərasim, bayram və cərəyanlarının ictimai-iqtisadi və siyasi şəraitindən bəhs edilir.Burada həmçinin Azərbaycanda filosof, tarixçi, politoloq, etnoqraf, arxeoloq və islamşünasların İslam dini haqqında apardığı elmi-tədqiqat işlərindən söhbət açılır.

23. Elza Əlipaşa qızı Mollayeva. “Azərbaycan xalq pedaqogikasında gender bərabərliyinə münasibət (metodik vəsait) . ADPU-nun nəşriyyatı, 2010, 26 səh.

24. M.İ.Əmrahov, N.N.Əsədov, H.İ.Həsənov. “Şərqi Avropada türk tayfa birlikləri”. Metodiki vəsait. ADPU-nun nəşriyyatı, 2010, 66 səh.

25. H. H. Əsgərova. “Landşaftşünaslıqdan çöl tədqiqat işlərinin aparılmasına dair metodik vəsait”. Bakı, ADPU-nun nəşriyyatı, 2008, 92 səh.

26. ƏliyevQ.H., Musayeva S.M., MəmmədovaS.Ə., İsmayılovaF.C. “Metal məmulatların hazırlanması texnologiyaları II. (praktik işlər). Bakı, ADPU-nun nəşriyyatı 2012, 61 səh.

27. “Uşaq psixologiyası”. Metodik vəsait. Bakı, ADPU-nun nəşriyyatı, 2011, 49 səh.

28. M.İ.Murquzov, C.İ.Hüseynov, T.A.Cəfərov. “Ümumi fizika kursundan məsələlər”. Atom və nüvə fizikası. Ali məktəblər üçün dərs vəsaiti. Bakı, “Ləman nəşriyyat poliqrafiya” MMC. 2005, 152 səh.

Dərs vəsaiti ümumi fizika kursunun “Atom və nüvə fizikası” bölməsinə aid məsələ həllinə həsr olunmuşdur.

29. Fuad Mamedov. “Kulğturoloqiə, kulğtura, üivilizaüiə”. Baku, “OL”nptk, 2015, 300 str.

30. “İstoriə Assoüiaüii kulğturı Azerbaydjana “Simurq”. 1990-2015, Baku, “OL”nptk, 2015, 392 str.

**Nüşabə Əmirəliyeva,**
**Elmi kitabxananın məlumat-biblioqrafiya şöbəsinin müdiri**

# ADPU-nun Şəki filialında “Qafqaz Albaniyasında İslam dininin yayılması” mövzusunda mühazirə dinlənilib

30 mart 2016-cı il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialında Azərbaycan Respublikasının millətlərarası, multikulturalizm və dini məsələlər üzrə Dövlət Müşaviri Xidməti, Bakı Beynəlxalq Multikulturalizm Mərkəzi və Azərbaycan Respublikasının Prezidenti Yanında Bilik Fondu tərəfindən keçirilən tədbirdə Azərbaycan Respublikasının millətlərarası, multikulturalizm və dini məsələlər üzrə Dövlət Müşaviri Xidmətinin aparıcı məsləhətçisi, ilahiyyat üzrə fəlsəfə doktoru Ceyhun Məmmədovun “Qafqaz Albaniyasında İslam dininin yayılması” mövzusunda maraqlı mühazirəsi dinlənilib.



Tədbirdə ADPU-nun Şəki filialının direktoru, fizika-riyaziyyat elmləri doktoru Rafiq Rasulov, Şəki Şəhər İcra Hakimiyyətinin nümayəndəsi Gündüz Paşayev, şəhər 7 nömrəli tam orta məktəbin direktoru Bəkir Xəlilov, filialın professor-müəllim heyəti və tələbə-gəncləri iştirak ediblər.

Tədbiri giriş sözü ilə ADPU-nun Şəki filialının elmi işlər üzrə direktor müavini, dosent N. Çələbiyev açıb və məruzə üçün sözü mühazirəçi, ilahiyyat üzrə fəlsəfə doktoru C.Məmmədova verib. Maraqlı mühazirədən sonra C.Məmmədov dinləyiciləri maraqlandıran sualları cavablandırıb.

# ADPU-nun Şəki filialında talassemiya xəstəliyi ilə mübarizəyə həsr olunmuş tibbi maarifləndirmə tədbiri keçirilib

15 mart 2016-cı il tarixdə Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Şəki filialında Azərbaycan Respublikasının Prezidenti yanında Gəncliyə Yardım Fondunun dəstəyi ilə irsi qan xəstəliyi olan talassemiyaya qarşı mübarizəyə həsr olunmuş tibbi maarifləndirmə tədbiri keçirilib.

Tədbiri giriş sözü ilə ADPU-nun Şəki filialının direktor müavini, dosent N.Çələbiyev açıb. Layihə rəhbəri Ceyhun Əliyev isə tədbirin məqsədindən, gənclər arasında sağlam həyat tərzinin bərqərar olmasının zəruriliyindən və talassemiyaya qarşı mübarizə yollarından bəhs edib. Tədbir iştirakçıları üçün mövzu ilə bağlı geniş videoçarx nümayiş etdirilib.

Tədbirdə çıxış edən Şəki Regional Qan Bankının baş həkimi Qorxmaz İbrahimxəlilov, Şəki Şəhər Gənclər və İdman İdarəsinin rəisi Vüqar İsgəndərov və başqaları sosial xəstəlik hesab edilən və 2005-ci ildən respublikamızda dövlət səviyyəsində diqqət mərkəzində saxlanılan talassemiyaya qarşı mübarizə yollarından, müalicə tədbirlərindən, gənclərin nikaha daxil olmazdan əvvəl tibbi müayinələrdən keçmələrinin zəruriliyindən danışıblar.

Tədbirin sonunda filialın bir qrup tələbəsi könüllü qanvermə aksiyasında iştirak edib.

## Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının dosenti

**Bəhruz Nəsirovun**

vəfatından kədərləndiyini bildirir,mərhumun ailəsinə və yaxınlarına dərin hüznlə başsağlığı verir.

Redaktor: Mənsur İBRAHİMOV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyli küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 985
Sayı: 1500
Çapa imzalanıb: 31.03.2016-cı il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, “Azərbaycan” nəşriyyatında səhifələnib və “Azərbaycan” nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.